

QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Aprel 2014 04 (1058)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## Bakı Xoreoqrafiya Akademiyasının yaradılması haqqında
### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

Azərbaycan Respublikasında xoreoqrafiya sənəti ənənələrinin qorunması və inkişaf etdirilməsi zərurətini nəzərə alaraq, bu sahə üzrə yüksəkixtisaslı kadrların hazırlanmasını təmin etmək məqsədi ilə Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

1. Bakı Xoreoqrafiya Məktəbinin bazasında ümumi, orta ixtisas və ali təhsil proqramlarını həyata keçirən Bakı Xoreoqrafiya Akademiyası yaradılsın.

2. Azərbaycan Respublikasının Mədəniyyət və Turizm Nazirliyi aidiyyəti qurumlarla birlikdə bu sərəncamın 1-ci hissəsində qeyd olunan Bakı Xoreoqrafiya Məktəbinin binasının yerləşdiyi sahədə Bakı Xoreoqrafiya Akademiyası binasının tikilməsi, zəruri avadanlıqlarla təchiz edilməsi ilə bağlı təkliflərini iki ay müddətində Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin.

3. Azərbaycan Respublikasının Nazirlər Kabineti:

3.1. Bakı Xoreoqrafiya Akademiyasının nizamnaməsinin layihəsini iki ay müddətində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

3.2. bu sərəncamdan irəli gələn digər məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 30 aprel 2014-cü il*

# Elmi Şuranın iclasında

**ADPU-nun Elmi Şurasının aprel ayının 16-da keçirilən iclasının gündəliyində əsasən üç məsələ durdurdu:**

***1.2013-cü ildə ADPU-nun professor-müəllim heyətinin apardığı elmi-tədqiqat işləri barədə hesabat;***

***2.Tarix fakültəsinin hesabatı;***

***3.AMEA-nın müxbir və həqiqi üzvlüyünə namizədlərin müzakirəsi və cari məsələlər.***

İclası universitetin rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, Elmi Şuranın sədri, professor Yusif Məmmədov açmış, I məsələ barədə danışmaq üçün sözü universitetin Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyevə vermişdir. Professor V.Əliyev öncə dövlət strukturları, təhsil müəssisələri, alim və mütəxəssislər qarşısında qoyulan vəzifələrdən bəhs etmiş, elmi qurumların strukturlarının müəyyənləşdirilməsinin, elmi-tədqiqatların müasir standartlar səviyyəsində aparılmasının, eləcə də zəruri standart və problemlərinin müəyyənləşdirilməsinin, ölkənin elmi kadr potensialının artırılması məqsədilə onun sosial müdafiəsinin gücləndirilməsinin, elmin inkişafı üzrə milli strategiyanın müəyyənləşdirilməsi və həyata keçirilməsinin, Azərbaycan elminin beynəlxalq elm məkanına inteqrasiyasının təmin olunmasının sürətləndirilməsinin bu vəzifələr sırasına daxil olduğunu söyləmişdir. Bu vəzifələrin icrası üçün Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin 2009-cu il may ayının 4-də "Azərbaycan Respublikasında 2009-2015-ci illərdə elmin inkişafı üzrə Milli Strategiyanın həyata keçirilməsi ilə bağlı Dövlət Proqramı" haqqında, həmçinin həmin il may ayının 22-də "2009-2013-cü illərdə Azərbaycan Respublikasının ali təhsil sistemində islahatlar üzrə Dövlət Proqramı" haqqında və 2013-cü il oktyabr ayının 24-də "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası haqqında" sərəncamları olduğunu, həmin sərəncamların elmi-tədqiqat işlərinin istiqamət, problem və mövzularına yenidən yanaşılması tələbini qarşıya qoyduğunu, ADPU Elmi hissəsinin də öz fəaliyyətini bu tələblərdən irəli gələn vəzifələrə uyğun qurduğunu söyləmişdir.

Professor V.Əliyev hesabat məruzəsində demişdir: "Yola saldığımız 2013-ci il respublikamızda həyatımızın bütün sahələrində çox böyük nailiyyətlər əldə edilməsi ili kimi yadda qalmışdır. Bu yüksəliş Azərbaycan Prezidenti cənab İlham Əliyevin zəkası, qətiyyəti, xalqın öz lideri ilə həmrəyliyi, daxili və xarici siyasətin düzgün aparılması, ulu öndərimiz Heydər Əliyevin ideyalarının ölkə Prezidenti cənab İlham Əliyev tərəfindən uğurla davam etdirilməsi, quruculuq işlərinə Heydər Əliyev Fondunun dəstəyi nəticəsində baş vermişdir.

Bir elm və təhsil müəssisəsi olaraq universitetimiz də qazanılan uğurlara öz töhfələrini vermişdir. Bu mənada biz 2006-cı ildən bu yana ADPU-nun elm və təhsil sahəsində həyata keçirdiyi islahatlarla fəxr edə bilərik. Azərbaycan xalqı nəyə nail olmuşdursa, - demişdir prorektor V.Əliyev, - bunun üçün xalqımız ulu öndər Heydər Əliyevin yaratdığı sağlam, bəşəri ideologiyaya və bundan irəli gələn proqramlara borcludur. 2003-cü ildə hakimiyyətə gələn cənab İlham Əliyev Ulu Öndərimizin işini layiqincə davam etdirir, azərbaycançılıq ideologiyasının möhkəmlənməsinə çalışır. Onun hər bir çıxışı, verdiyi qərar və sərəncamlar bu işə xidmət göstərir. Xüsusilə elm, təhsil, səhiyyə, mədəniyyət kimi sahələrə böyük qayğı və diqqət göstərir. Cənab İlham Əliyev «Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası»nda təhsilimizin mühüm məsələlərini, onun inkişaf istiqamətlərini dəqiq müəyyənləşdirmiş, Təhsil Nazirliyinin, elm və təhsil müəssisələrinin qarşısında mühüm vəzifələr qoymuşdur. Bu vəzifələr Azərbaycan müəllimlərinin 14 dekabr 2013-cü ildə keçirilən XIV qurultayında Təhsil Naziri Mikayıl Cabbarovun hesabat məruzəsində öz əksini çox aydın tapmışdır. Ötən müddət ərzində baş vermiş dönüş göz önündədir. ADPU-nun professor-müəllim heyəti və tələbə kollektivi yuxarıda qeyd etdiyimiz Prezident sərəncamlarından və Təhsil Nazirinin Azərbaycan müəllimlərinin XIV qurultayındakı çıxışından irəli gələn vəzifələri yaxşı dərk edir və bu istiqamətlərdə konkret addımlar atır. Universitetin Elmi Şurasının rektor, AMEA-nın müxbir üzvü, professor Y.Məmmədovun və tanınmış alimlərimizin çıxışları işlərin yenidən qurulduğundan xəbər verir.

Daha sonra professor V.Əliyev Elmi hissənin fəaliyyət istiqamətləri (kafedralarda aparılan ETİ-yə nəzarət, doktorant və dissertantların fəaliyyətinə nəzarət, Müdafiə Şurası və elmi-nəzəri seminarların, eləcə də nəşriyyat şöbəsinin fəaliyyəti ilə əlaqədar işlər, beynəlxalq və respublika səviyyəli konfransların təşkili, xarici universitetlərlə əlaqə, elmi-tədqiqat laboratoriyalarının fəaliyyətinə nəzarət) haqqında ətraflı məlumat vermişdir. Demişdir ki, respublikamızda təhsil sahəsində apa□rılan uğurlu islahatlarda Pedaqoji Universitetin də xüsusi payı vardır. Bu mənada 2013-cü ildə Pedaqoji Universitetin rəhbərliyi və professor-müəllim heyəti əhəmiyyətli işlər görmüşdür.

Professor V.Əliyevin çıxışından məlum olmuşdur ki, ADPU-da 10 fakültədə 51 ixtisas kafedrası, 7 ETL-si, Əlavə təhsil fakültəsi, Magistratura və doktorantura şöbələri, TEC, çox zəngin kitabxana, 3 oxu zalı, 8 kompyuter otağı və fənn laboratoriyaları fəaliyyət göstərir. Qısa bir müddətdə universitetdə müasir tələblərə cavab verən 1 Kompyuter Mərkəzi istifadəyə verilmiş, kafedra və dekanlıqlar kompyuterlərlə təmin olunmuşdur. Elmi-tədqiqat işləri bir neçə formada və mərhələdə (elmitədqiqat işləri yazmaqla, dərslik, dərs vəsaiti və metodik göstərişlər hazırlamaqla, ixtisas kurslarını keçməklə, elmi konfrans, seminar və simpoziumlarda iştirak etməklə, magistratura və doktorantura yolu ilə) yerinə yetirilir. Tələbələr isə öhdələrinə düşən vəzifəni TEC yolu ilə, dərnəklərdə məruzə oxumaqla, fənn olimpiadalarında, tələbə elmi konfrans və seminarlarında iştirakları ilə həyata keçirmiş olurlar.






Məruzəçi çıxışında universitetimizdə fəaliyyət göstərən laboratoriyaların və Elmi kitabxananın fəaliyyətindən ətraflı bəhs etmiş, adıçəkilən qurumların qarşıya qoyulan vəzifələrin həyata keçirilməsi işində universitetimizin professor-müəllimlərinin yaxın köməkçisi, dayağı olduğunu qeyd etmişdir. 2013-cü ildə 734 nəfər əməkdaşımızın elmi-tədqiqat işlərinin yüksək səviyyədə işlənməsinə məsuliyyətlə yanaşdıqlarını, illik hesabatları vaxtında təqdim etdiklərini, hesabat ilində professor-müəllim heyətinin apardığı ETİ-i kafedraların profilinə uyğun olaraq 71 istiqamətdə 90 problemi və 437 mövzunu əhatə etdiklərini söyləmiş, 98 işin tədris prosesində tətbiq olunduğunu söyləmişdir.

Professor V.Əliyev öz hesabat məruzəsində demişdir: "Aparılmış elmi-tədqiqat işlərinin nəticəsi olaraq 24 monoqrafiya, 31 dərslik, 78 dərs vəsaiti, 261 metodik vəsait, 620 məqalə (onlardan 559-u respublika, 61-i xarici mətbuat səhifələrində) və 281 tezis (onlardan 250-si respublika, 31-i xarici mətbuat səhifələrində) çap olunmuşdur.

Universitetin professor-müəllim heyəti 2013-ci ildə keçirilmiş 2 beynəlxalq və 6 res□publika konfransında iştirak etmişdir. O cümlədən ADPU-da tələbələrin 12 elmi konfransı keçirilmişdir.

Hesabat dövründə ADPU əməkdaşlarından 2 nəfər elmlər doktoru, 3 nəfər fəlsəfə doktoru dissertasiyası müdafiə etmiş, 6 nəfər professor, 5 nəfər dosent vəzifəsinə layiq görülmüşdür.

Professor V.Əliyev çıxışının sonunda Elmi hissənin fəaliyyətinin daha da gücləndirilməsinə xidmət edən təkliflərlə çıxış etmişdir. Hansılardır bu təkliflər?

1.Universitetin elmi strukturunda islahatların aparılması, nəzərdə tutulan 7 ETL-nın bazasında bir ETL-nı yaratmaq daha faydalı olardı. Elmi-tədqiqat işlərinin planlaşdırılması, mövzuların koordinasiya olunmasını həyata keçirən Koordinasiya Şurasının yaradılması vaxtı çatmışdır;

2.Kafedralarda səmərəsiz və formal xarakter daşıyan elmi araşdırmalar əvəzinə müasir tələblərə cavab verən yeni dərslik, dərs vəsaiti və metodik vəsaitlərin yazılması məqsədəuyğun olardı;

3."İlin alimi" müsabiqəsinə verilən tələblər artırılmalı, alimin mətbuatda, televiziyada çıxışları, konfrans və simpoziumlarda fəallığı, ziyalı mövqeyi, dövlətçiliyə, milli-mənəvi dəyərlərə xidməti nəzərə alınmalıdır.

Elmi Şura üzvləri professor V.Əliyevin məruzəsini qənaətbəxş qiymətləndirmişlər.

***

Sonra ADPU-nun rektoru, professor Y.Məmmədov ulu öndər Heydər Əliyevin anadan olmasının 91-ci ildönümü münasibətilə universitetdə həyata keçirilən tədbirlərdən danışmış, müvafiq qurumlara bu yöndə fəaliyyətlərini genişləndirməyi tapşırmış, həmçinin AMEA-nın Tarix İnstitutunun 66 adda kitabı ADPU-nun Elmi kitabxanasına hədiyyə olaraq bağışladığı barədə Elmi Şura üzvlərini məlumatlandırmışdır.

***

Daha sonra Tarix fakültəsinin hesabatı dinlənilmişdir. Hesabat məruzəsi ilə fakültənin dekanı, professor Oqtay Sultanov çıxış etmişdir.

Professor O.Sultanovun özünün də söylədiyi kimi, fakültə Elmi Şuranın bu iclasına ötən hesabat dövründən sonra kollektivin həyatında baş verən keyfiyyət dəyişiklikləri ilə gəlmişdir. Hansılardır bu keyfiyyət dəyişiklikləri?

Professor O.Sultanov bu müddətdə fakültənin üç müəlliminin "Əməkdar müəllim" fəxri adına, bir

**(Davamı 2-ci səhifədə)**

# Elmi Şuranın iclasında

(Əvvəli 1-ci səhifədə)

nəfərin isə Dövlət mükafatına layiq görüldüyünü söylədi və bu diqqət üçün rektor Y.Məmmədova minnətdarlığını bildirdi.

Dekan O.Sultanov fakültənin kadr potensialı haqqında danışarkən, hazırda fakültədə 100 nəfər əməkdaşın çalışdığını və onların hansı vəzifələri tutduğunu bildirdi. Kadr potensialının yaş həddinin heç də ürəkaçan olmadığını, bu göstəricinin Azərbaycan tarixi və Fəlsəfə kafedraları üzrə 60, Ümumi tarix və Ümumi pedaqogika kafedraları üzrə 50, İqtisadi və sosial fənlər kafedrası üzrə 54, yalnız Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrası üzrə 46 olduğunu söylədi: "Yaranmış vəziyyətin ən başlıca səbəblərindən biri sözügedən kafedralarda elmi kadr hazırlığı istiqamətində işin zəif aparılmasıdır. Gələnən nəticə göstərir ki, bu gün fakültə köhnə potensialın üzərində dayanır, yeni potensial isə olsa-olsa fəlsəfə doktorları kimi elmi kadr imkanlarına malikdir. Təəssüf ki, elmlər doktoru hazırlığı işi kafedralarda diqqətdən kənarda qalmışdır. Texniki heyətdə də (bu say 14-dür) yaş həddi ürəkaçan deyil. Bu hal özünü daha çox Azərbaycan tarixi, Ümumi pedaqogika, İqtisadi və sosial fənlər kafedralarında göstərir.

Dekan mövcud vəziyyətdən çıxış yolunu kənardan elmlər doktorlarını dəvət etməklə (kafedraların dərs yükü nəzərə alınmaqla) fakültənin kadr potensialını gücləndirməyin mümkünlüyünü söylədi.

Professor O.Sultanovun toxunduğu məsələlərdən biri orta məktəblərdə kişi müəllimlərin azlığı ilə bağlı oldu. O, bu istiqamətdə araşdırmanı rəhbərlik etdiyi fakültənin timsalında təhlil etdi. Belə ki, əyani şöbədə təhsil alan 594 nəfərdən 402 nəfərini qızlar təşkil edir, digər fakültələrdə, eləcə də digər ali məktəblərdə də bu göstərici ürəkaçan deyil. Dekan bu halı diqqətə çatdırmaqla bu gün orta məktəblərdə kişi tərbiyəsinə ciddi ehtiyac olduğunu və gələcəkdə müəllim kadrları hazırlığı işində oğlan abituriyentlərə üstünlük verilməsinin vacibliyini diqqətə çatdırdı.

Tarix fakültəsinin dekanı, professor O.Sultanovun hesabat məruzəsi Elmi Şura üzvləri tərəfindən müsbət qiymətləndirildi.

***

Elmi Şuranın iclasında ADPU-nun müəllimlərindən üç nəfərinin - Riyazi analiz kafedrasından professor Malik Cəbrayılovun, Nəzəri fizika kafedrasından professor İsgəndər Cəfərovun, Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasından professor Oqtay Sultanovun AMEA-nın müxbir üzvlüyünə namizədlikləri, həmçinin BDU-nun müvafiq kafedrasından AMEA-nın həqiqi üzvlüyünə namizədliyi irəli sürülmüş rektor Yusif Məmmədovun namizədliyi dəstək mənasında gizli səsverməyə buraxıldı. Xarici dillər kafedrasının baş müəllimi Taisa Quliyevaya, Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının dosenti Roza Ağayevaya və Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının baş müəllimi Arif Kazımova, həmin fakültənin 301-ci qrup tələbələrinə pedaqoji təcrübə keçdikləri məktəblərdən universitetə təşəkkür məktubları daxil olduğu açıqlandı.

Rektor Y.Məmmədovun verdiyi məlumata görə, Sosial Hüquqların Monitorinqi Qrupu bu il yanvar ayının 5-dən Təhsil Nazirliyinin tabeçiliyində olan qurumlar arasında monitorinqlər aparmışdır. Monitorinqlər anonim sorğular və ictimai nəzarət yolu ilə həyata keçirilmişdir. Təxminən 50-yə qədər qurum arasında keçirilən monitorinqlərin nəticəsi olaraq həm mənfi hallara qarşı mübarizədə, həm müəllim-şagird-tələbə münasibətlərində, həm təhsilin səviyyəsi, həm də təhsil müəssisələrinin inzibati binalarının daxilindəki vəziyyət baxımından ADPU yüksək göstəriciləri ilə fərqlənmişdir.

**Ayətxan İSGƏNDƏROV**

# Ümummilli lider Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr olunmuş bədii yaradıcılıq festivalı





May ayının 10-da xalqımızın dahi oğlu, müstəqil Azərbaycan dövlətinin banisi və qurucusu, ümummilli lider Heydər Əliyevin anadan olmasının 91-ci ildönümü tamam olur. Bir faktı xüsusi qeyd etmək yerinə düşər ki, dahi öndər Heydər Əliyev xalqımızın yüksək milli-mənəvi dəyərlərinin qorunmasında, onların dövlətçiliyin ayrılmaz tərkib hissəsinə və bu dəyərlərin təbliğ edilməsinin dövlət siyasətinin əsas istiqamətlərindən birinə çevrilməsində böyük rol oynamışdır. Təhsil Nazirliyi və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin birgə müvafiq qərarı əsasında ümummilli lider Heydər Əliyevin anadan olmasının 91-ci ildönümü münasibətilə respublikamızın ali məktəb tələbələri arasında bədii yaradıcılıq festivalı keçirilir. Bu bədii yaradıcılıq festivalının keçirilməsində əsas məqsədi tələbə-gənclərin milli vətənpərvərlik, adət-ənənələrimizə, mədəniyyətimizə, incəsənətimizə hörmət ruhunda tərbiyə etmək və eyni zamanda onların incəsənət sahəsindəki istedadlarını üzə çıxararaq inkişaf etdirməkdir. Festivalın keçirilməsi üçün 5 nəfərdən ibarət Təşkilat Komitəsi və tərkibinə xalqımızın tanınmış incəsənət və mədəniyyət xadimlərinin daxil edildiyi 7 nəfərdən ibarət Münsiflər Heyəti yaradılmışdır.

Mart ayından başlayaraq keçirilən festivalda ölkəmizin bütün dövlət və qeyri-dövlət ali məktəblərinin tələbələri iştirak edirlər. Qeyd edək ki, aprel ayının 9-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) adıçəkilən bədii yaradıcılıq festivalının seçim turu keçirilmişdir. Seçim turunda ADPU-nun, Azərbaycan Müəllimlər İnstitutunun, Azərbaycan Əmək və Sosial Münasibətlər Akademiyasının təxminən 70-dən çox tələbəsi iştirak etmişdir. Seçim turunda ADPU-nun tələbələri yüksək səviyyəli çıxışları ilə diqqəti cəlb etmişlər. Onu da qeyd edək ki, festival qaliblərinin yekun konsertinin bu il may ayının birinci ongünlüyündə keçirilməsi nəzərdə tutulur.

**Könül MƏMMƏDOVA,**
**Tarix fakültəsinin II kursunun 203-cü qrup tələbəsi**

# Ulu öndər Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr edilmiş elmi-praktik konfrans

Bu il aprel ayının 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Pedaqoji fakültəsinin Musiqi fənləri və onun tədrisi metodikası kafedrasında xalqımızın dahi oğlu, müstəqil dövlətimizin memarı və qurucusu, ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr edilmiş "Hacıbəyovlar nəsli-Zülfüqar Hacıbəyov-130" mövzusunda elmi-praktik konfrans keçirilmişdir. Məlumat üçün qeyd edək ki, konfransın Təşkilat Komitəsinin sədri Pedaqoji fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmovdur. Konfransda Bakı Musiqi Akademiyasının Elmi işlər üzrə prorektoru, Əməkdar incəsənət xadimi, professor Gülnaz Abdullazadə, Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin Musiqi alətləri kafedrasının müdiri, sənətşünaslıq üzrə fəlsəfə doktoru, Əməkdar incəsənət xadimi, dosent Sonaxanım İbrahimova dəvət əsasında qonaq qismində iştirak etmişlər. Konfransda həmçinin ADPU-nun Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının müdiri, professor Jalə Qədimova, Musiqi alətləri fənlərinin tədrisi metodikası kafedrasının müdiri, professor Minarə Dadaşova, İbtidai siniflərdə rus dili kafedrasının müdiri, dosent Ramidə Məmmədova, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Yaqut Rzayeva və kafedraların əməkdaşları iştirak etmişlər.

Konfransı giriş sözü ilə açan professor Fərrux Rüstəmov tədbir iştirakçılarını və qonaqları salamlamış, ulu öndər Heydər Əliyevi xalqımızın dünya miqyaslı dövlət və siyasət xadimi kimi səciyyələndirmiş və konfransın işinə uğurlar arzulamışdır. Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının müdiri, professor Jalə Qədimova çıxış edərək ulu öndər Heydər Əliyevin xalqımız və dövlətimiz qarşısında göstərdiyi böyük və əvəzsiz xidmətlərindən, onun öz müdrik siyasəti ilə Azərbaycanın tarixinə milli xilaskar və müasir intibahının banisi kimi daxil olduğundan danışmışdır. Professor J.Qədimova xalqımızın müdrik oğlu Heydər Əliyevin bütün incəsənət və mədəniyyət xadimləri kimi, Hacıbəyovlar nəslinə də xüsusi qayğı və diqqətlə yanaşdığını qeyd etmişdir. Konfransda çıxış edən professor M.Dadaşova Hacıbəyovlar nəslinin, o cümlədən Zülfüqar Hacıbəyovun Azərbaycanın musiqi mədəniyyətinin inkişafındakı əvəzsiz xidmətlərindən danışmışdır.





Konfransda Əməkdar müəllim, dosent Elmira Əfəndiyeva "Üzeyir Hacıbəyli və Azərbaycanda musiqi tənqidi", müəllim Aynur Hüseynova isə "Azərbaycanın görkəmli xadimləri: Hacıbəyovlar ailəsi və ailənin tanınmış nümayəndələri" mövzularında məruzələrlə çıxış etmişlər. Onların məruzələri maraqla qarşılanmışdır.

Sonda professor J.Qədimova bütün konfrans iştirakçılarına və qonaqlara tədbirdə iştirak etdiklərinə görə öz təşəkkürünü bildirmişdir.

**Mətbuat və informasiya şöbəsi**

# Xalqa, Vətənə sədaqətlə xidmət nümunəsi

## Səbail rayon məktəbliləri ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətini dərindən öyrənirlər




Səbail rayonunun ümumtəhsil məktəblərində Azərbaycanın müasir tarixinin daha səmərəli öyrənilməsi məqsədi ilə XI sinif şagirdləri üçün «Ulu öndər Heydər Əliyev müstəqil Azərbaycanın qurucusu və memarıdır» və «Ümummilli lider Heydər Əliyevin ideyaları müasir Azərbaycanın sosial-iqtisadi inkişafının təminatçısıdır» mövzularında açıq dərslərin keçirilməsi davam edir. Fevral-mart aylarında bu dərslər Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasında və Yeni Azərbaycan Partiyası Səbail rayon təşkilatının qərargahında keçirilmişdir.

Dərslərin yüksək səviyyədə, sistemli və planlı şəkildə keçirilməsi məqsədi ilə xüsusi qrafik tərtib olunmuş, rayonun orta və ali məktəblərinin peşəkarlığı, elmi-nəzəri, metodiki hazırlığı ilə fərqlənən nüfuzlu tarix müəllimləri seçilərək onlar üçün seminar keçirilmişdir.

Açıq dərslərin keçirildiyi müddətdə XI sinif şagirdlərinin Dövlət Sərhəd Xidmətinin Mərkəzi Aparatındakı Heydər Əliyev Elmi Araşdırmalar Mərkəzinə ekskursiyaları və Fəxri Xiyabanda ümummilli lider Heydər Əliyevin məzarını ziyarət etmələri nəzərdə tutulmuşdur.

Qeyd edək ki, növbəti açıq dərs aprel ayının 4-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) iclas zalında keçirilmiş, dərsdə 150 nəfər XI sinif şagirdi, Səbail Rayon İcra Hakimiyyətinin məsul işçiləri, pedaqoji işçilər, həmçinin universitetin müəllimləri iştirak etmişlər.

İlk olaraq şagirdlər və qonaqlar ulu öndər Heydər Əliyevin universitetdəki abidəsini ziyarət etdilər və önünə çiçəklər düzdülər. Sonra universitetin Heydər Əliyev muzeyi ilə tanış oldular. Ulu öndər Heydər Əliyevin muzeydə nümayiş olunan fotoları, onunla bağlı digər sənədlər, xüsusilə də ADPU-da keçirilən tədbirlərdə iştirakı ilə bağlı stendlər məktəblilərdə xoş təəssüratlar oyatmışdır.

2 saylı Texniki-Humanitar Elmlər Liseyinin tarix müəllimi Sevil Nəsibova tərəfindən keçirilən açıq dərs canlı ünsiyyət və şagirdlərin yüksək fəallığı şəraitində keçmişdir. Qeyd olunmuşdur ki, bütün həyatını xalqının tərəqqisi və inkişafına həsr etmiş ulu öndər Heydər Əliyev müstəqil Azərbaycanın gələcəyi naminə gördüyü nəhəng işlər ona öz xalqının qəlbində əbədi yaşamaq səadəti bəxş etmişdir. Bu dahi şəxsiyyətin mənalı və şərəfli həyat yolu xalqa, Vətənə sədaqətlə xidmət etmək nümunəsidir.

Ümummilli Liderin zəngin həyat yolu ilə tanış olan məktəblilər Ulu Öndərin Azərbaycanda yenidən hakimiyyətə qayıdışından sonrakı böyük fəaliyyətinə xüsusi maraq göstərmişlər.

Daha sonra ADPU-nun Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının müdiri, dosent Rəcəb Əliyev və həmin kafedranın professoru Mais Əmrahov çıxış edərək bildirmişlər ki, dahi rəhbər Heydər Əliyevin ötən əsrin 90-cı illərinin əvvəllərində erməni təcavüzü nəticəsində işğal və parçalanmaq təhlükəsi ilə üzbəüz qalmış Azərbaycanda müstəqil dövlət quruculuğu sahəsində fəaliyyəti ölçüyəgəlməz olmuşdur. Xalqımızın bu böyük oğlunun fədakarlığı və uzaqgörən siyasəti sayəsində mövcud problemlər, dövlət çevrilişi cəhdləri aradan qaldırılmış və ölkəmizin gələcək iqtisadi inkişafı üçün böyük zəmin yaradılmışdır. Ulu öndər Heydər Əliyevin layiqli davamçısı olan Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin apardığı siyasət və məqsədyönlü fəaliyyət nəticəsində bu gün Azərbaycan iqtisadi inkişafı və hərbi qüdrəti ilə regionun aparıcı dövlətinə çevrilmişdir. Azərbaycanın hərtərəfli inkişafı onun dünya dövlətləri arasında olan nüfuzunun durmadan artmasına səbəb olmuşdur.

Ulu öndər Heydər Əliyevin həyat və fəaliyyəti ilə bağlı məlumatlar şagirdlər tərəfindən böyük maraqla qarşılanmışdır.

**"Gənc müəllim"**



# "Vətəndaş cəmiyyətinin inkişafında təhsilin rolu"



Bu il aprel ayının 23-də Azərbaycan Milli Qeyri-Hökumət Təşkilatları Forumu (MQF) Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Vətəndaş cəmiyyətinin inkişafında təhsilin rolu" mövzusunda tədbir keçirib. Tədbiri giriş sözü ilə açan ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev belə maarifləndirici tədbirlərin keçirilməsini təqdirəlayiq hal kimi qiymətləndirib və belə tədbirlərin tələbə-gənclərin dünyagörüşlərinin formalaşmasında mühüm rol oynadığını qeyd edib. Professor Vilayət Əliyev bildirib ki, təhsil hər bir cəmiyyətin inkişafında əsas şərt, başlıca amildir. Bütün sivil, demokratik cəmiyyətlərdə qeyri-hökumət təşkilatları, ictimai birliklər vətəndaş cəmiyyətinin əsas atributları sayılır. Qeyri-hökumət təşkilatları, ictimai birliklər təhsil müəssisələri ilə sıx əməkdaşlıq etməli, bu sahədə mövcud olan problemlərin həllinə dair öz fikir və təkliflərini bildirməli, müxtəlif maarifləndirici layihələr hazırlayıb həyata keçirməlidirlər.

Tədbirdə çıxış edən MQF-nin prezidenti Rauf Zeyni tədbirin keçirilməsində göstərdiyi köməyə görə ADPU-nun rəhbərliyinə öz təşəkkürünü bildirmişdir. Rauf Zeyni rəhbərlik etdiyi qurumun fəaliyyəti haqqında məlumat verərək bildirmişdir ki, Azərbaycan Milli Qeyri-Hökumət Təşkilatları Forumu 1999-cu il iyun ayının 11-də 95 QHT tərəfindən təsis edilmişdir və hazırda öz sıralarında 630 təşkilatı birləşdirən bir ictimai koalisiyadır. MQF-nin əsas məqsədi milli qeyri-hökumət təşkilatları hərəkatının genişləndirilməsi, üçüncü sektorun və vətəndaş cəmiyyətinin inkişafı, QHT-lərin fəaliyyətinin qabaqcıl beynəlxalq təcrübəyə və mövcud qanunvericiliyə uyğun qurulması, koordinasiya edilməsi, dövlət təşkilatları, bələdiyyələr, milli və beynəlxalq donorlar, həmçinin media və özəl sektorla QHT-lərin qarşılıqlı faydalı əməkdaşlığının təmin olunması və onların üzləşdiyi problemlərin birgə həllinə yardım etməkdir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 2007-ci il iyul ayının 27-də "Azərbaycan Respublikasının qeyri-hökumət təşkilatlarına dövlət dəstəyi Konsepsiyası"nın təsdiq edilməsi haqqında sərəncam imzalamış və bununla da ölkəmizdə QHT-lərin və bütövlükdə vətəndaş cəmiyyətinin inkişafına çox böyük təkan vermişdir.

Rauf Zeyni çıxışına davam edərək bildirmişdir kii, MQF bu ilin mart ayından etibarən Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının maliyyə dəstəyi ilə "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasından irəli gələn aktual məsələlərlə bağlı ictimai müzakirələrin təşkili" adlı layihəni icra edir. Layihənin əsas məqsədi Azərbaycanın gələcək inkişafını təmin edən bu proqramdan əhalinin xəbərdar olması, bütün ictimaiyyətin məlumatlandırılması, geniş kütlələrin bu müzakirələrə cəlb olunması, yüzlərlə vətəndaşın, mütəxəssisin, alimlərin, dövlət məmurlarının, QHT və media nümayəndələrinin sözügedən proqramla bağlı müzakirələrdə iştirak etmələrinə şərait yaradılması və bu Konsepsiyanın mahiyyətinin geniş kütlələrə lazımi səviyyədə çatdırılmasından ibarətdir. Layihə çərçivəsində "İntellektual insan və vətəndaş cəmiyyəti" adlı ilk tədbir bu il mart ayının 28-də Beynəlxalq Mətbuat Mərkəzində keçirilmiş və bu tədbir ictimaiyyətin böyük marağına səbəb olmuşdur. Layihə çərçivəsində 8 mövzuda tədbirlərin keçirilməsii nəzərdə tutulur. Layihə üzrə Bakı şəhəri ilə yanaşı, Quba və Qəbələ rayonlarında da tədbirlər keçiriləcəkdir. Bu gün ADPU-da keçirilən bu tədbir də həmin layihə çərçivəsində keçirilən tədbirlərdən biridir.

Azərbaycan Təhsil Şurasının sədri, professor Əjdər Ağayev tədbirdə "Vətəndaş cəmiyyətinin inkişafında təhsilin rolu" mövzusunda məruzə ilə çıxış etmişdir. Professor Əjdər Ağayev bildirmişdir ki, təhsil hər bir xalqın, dövlətin həyatında müstəsna rol oynayan, ölkənin hərtərəfli inkişafını təmin edən strateji bir sahədir. Təhsil sahəsində qarşıya qoyulan vəzifələrin həllinə nail olmaq isə ümummilli məsələdir. Bu sahədə qarşıya qoyulan məqsəd və vəzifələrin uğurlu həllinə nail olmaq üçün bütün cəmiyyət bu prosesdə həmrəy olmalı, vətəndaş fəallığı önə çəkilməlidir. Elə buna görə də milli təhsil sistemimizdə mövcud olan problemlərin aradan qaldırılması və təhsilin keyfiyyətinin yüksəldilməsi üçün dövlət təşkilatları ilə yanaşı, vətəndaş cəmiyyəti institutları sayılan qeyri-hökumət təşkilatları, ictimai birliklər fəal olmalı, bu sahəyə öz töhfələrini verməlidirlər. Bu vacib məqam "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda da öz əksini tapmışdır. Bu baxımdan, professor Ə.Ağayev MQF-nin ADPU-da keçirdiyi tədbiri təqdirəlayiq bir hal kimi qiymətləndirdi.



Tədbirdə çıxış edən Milli Məclisin deputatı, professor Musa Qasımlı ölkəmizdə təhsil sahəsində həyata keçirilən dövlət siyasətindən danışmış, Azərbaycan Prezidenti İlham Əliyevin elm və təhsil sahəsinə göstərdiyi böyük qayğı və diqqəti məmnunluq hissi ilə qeyd etmişdir. Professor M.Qasımlı təhsil müəssisələrinin maddi-texniki bazasının gücləndirilməsini, onların müasir informasiya-kommunikasiya texnologiyaları ilə təmin edilməsini və kadr hazırlığının səviyyəsinin yüksəldilməsini ölkə rəhbərliyinin bu sahəyə olan yüksək qayğı və diqqətinin təzahürü kimi səciyyələndirmişdir.

Təhsil Nazirliyinin İnformasiya şöbəsinin qeyri-hökumət təşkilatları və kütləvi informasiya vasitələri ilə iş sektorunun müdiri Cəsarət Valehov tədbirdə çıxış edərək təmsil etdiyi nazirliyin qeyri-hökumət təşkilatları ilə sıx əməkdaşlıq etdiyini və bu əməkdaşlığın hazırda keyfiyyətcə yeni mərhələyə daxil olduğunu bildirdi. Bu əməkdaşlıq təhsil sahəsinin inkişafına öz töhfələrini verəcəkdir.

Azərbaycan Turizm İnstitutunun kafedra müdiri, vətəndaş cəmiyyəti fəalı İsrail İsgəndərov tədbirdə slayd görüntüləri əsasında layihəni təqdim etdi.

Tədbirdə iştirak edən sosioloq Əhməd Qəşəmoğlu və vətəndaş cəmiyyətinin digər tanınmış nümayəndələri öz çıxışlarında MQF-nin yeni layihəsində təhsil sahəsi ilə bağlı mövzuların geniş yer almasını müsbət bir hal kimi qiymətləndirdilər və MQF-yə fəaliyyətində uğurlar arzuladılar.

**Mənsur QÜDRƏTOĞLU**

# «Yaşlı nəslin təcrübəsindən faydalanaq»



Səbail Rayon İcra Hakimiyyəti və Ailə, Qadın və Uşaq Problemləri üzrə Dövlət Komitəsinin birgə təşkilatçılığı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) bu il aprel ayının 24-də «Yaşlı nəslin təcrübəsindən faydalanaq» mövzusunda genişmiqyaslı maarifləndirmə layihəsi çərçivəsində tədbir keçirilmişdir. Səbail Rayon İcra Hakimiyyəti və Ailə, Qadın və Uşaq Problemləri üzrə Dövlət Komitəsinin, Gənclər və İdman İdarəsinin, rayon ictimaiyyətinin, Veteranlar və Ağsaqqallar Şuralarının nümayəndələrinin, ağbirçəklər, gənc ailələrin nümayəndələrinin, ali məktəb tələbələrinin və gənc müəllimlərin, ziyalıların, gənc fəalların iştirakı ilə keçirilən tədbiri ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev açaraq iştirakçıları salamlamış, tədbirin məqsədi və məramı barədə məlumat vermiş, Azərbaycanda ailə və mili-mənəvi dəyərlərin qorunub-saxlanılması, ailənin möhkəmləndirilməsi ilə bağlı tələbə-gənclər arasında maarifləndirmə işlərinin aparılmasının vacibliyindən danışmışdır. Professor V.Əliyev ulu öndər Heydər Əliyevin həyat yoldaşı, görkəmli oftalmoloq-alim, tibb elmləri doktoru, akademik Zərifə Əliyevanın fəaliyyətindən, onun necə həkim, qadın və ana olması, öz həyatı ilə bugünkü gənclərə nümunə olmasından danışmışdır.

Sonra çıxış edən Ailə, Qadın və Uşaq Problemləri üzrə Dövlət Komitəsinin sədr müavini Aynur Sofiyeva təmsil etdiyi komitə adından belə bir maarifləndirmə tədbirinin keçirilməsinə göstərdiyi köməkliyə görə ADPU-nun rəhbərliyinə öz təşəkkürünü bildirmişdir. Aynur Sofiyeva bildirmişdir ki, bu mövzuda aprel ayında Bakı şəhərinin 12 rayonunda müxtəlif tədbirlər keçirmişdir, yekunlaşdırıcı tədbirin isə may ayında keçirilməsi nəzərdə tutulur. Məqsəd gənclərlə dialoq qurmaqdır. Ümumiyyətlə, adıçəkilən komitə bu istiqamətdə digər layihələri də həyata keçirir. Bu layihələrin həyata keçirilməsində başlıca məqsəd cəmiyyətin diqqətinin ailə institutuna yönəltməkdir. Gənc nəslin kreativliyi ilə yaşlı nəslin təcrübəsinin sintezi ailə institutunun qorunmasında mühüm rol oynayır. Hazırda ailə-məişət zorakılığı ailələr üçün ciddi fəsadlar yaradır. Son illər Azərbaycanda ailə-məişət zorakılığı ilə bağlı müvafiq qanunlar qəbul edilib, nəzərdə tutulan cəzalar sərtləşdirilib. Qeyd etmişdir ki, qloballaşan dünyada ən mühüm məqamlardan biri sosial-mənəvi mühitin saflığının təmin olunmasıdır: "Qarşımızda duran əsas məsələ gənclərdə özünü müdafiə, sosial instinktin formalaşmasıdır ki, bu istiqamətdə də alimlərimizin, ziyalılarımızın, ağsaqqallarımızın, ağbirçəklərimizin üzərinə böyük məsuliyyət düşür". Layihənin də yaşlı nəsil ilə gənc nəsil arasında dialoq funksiyası daşıdığını bildirərək yaşlı nəslin xalqın ən yaxşı adət-ənənələrinin saxlayıcısı, daşıyıcısı və gələcək nəslə ötürücüsü olduğunu vurğulayıb.

Səbail Rayon İcra Hakimiyyəti başçısının birinci müavini Xalidə Bayramova, dövlət ailə siyasətinin dəstəklənməsi, milli-mənəvi və ümumbəşəri dəyərlərin qorunub saxlanılaraq gələcək nəsillərə ötürülməsi, gənclərin yaşlılara hörmət, kiçiklərə qayğı ruhunda tərbiyə olunmaları, ailə həyatına hazırlığı məqsədi ilə mütəmadi olaraq maarifləndirmə tədbirlərin keçirilməsinə verilən önəmdən, bu sahədə dövlət tərəfindən görülən işlər haqqında danışmışdır. Qeyd etmişdir ki, Azərbaycan xanımı xalqımızın milli-mənəvi dəyərlərinin qorunaraq, gələcək nəsillərə ötürülməsində müstəsna rola malikdir. Hazırda milli dəyərlərimizin və mədəniyyətimizin fəal təbliğatçısı, ümummilli problemlərimizin dünya müstəvisinə çıxarılmasında əvəzsiz xidmətləri olan Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili Mehriban Əliyevanın haqq-ədalət, humanizm, xeyriyyəçilik və bəşəri prinsiplərə söykənən çoxşaxəli fəaliyyətinin nəinki Azərbaycan qadınları, eləcə də dünya qadınları üçün əsl örnək olduğunu vurğulamışdır. Bildirmişdir ki, cəmiyyət kiçik ailələrdən ibarətdir və cəmiyyətin formalaşmasında əsas fiqur kimi qadının böyük rolu vardır.



Tədbirdə həmçinin Əməkdar müəllim Bela Cəlilova, Azərbaycan Qadınlar Cəmiyyəti Səbail rayon təşkilatının sədri Rəfiqə Qazıyeva, universitetin Elmi katibi, dosent Laçın Həsənova, Elmi kitabxananın direktoru Azər Hüseynov, Filologiya fakültəsinin dekan müavini, dosent Pəri Paşayeva, kafedra müdirləri İramin İsayev, Müseyib İlyasov, Biologiyanın tədrisi metodikası kafedrasının dosenti Həqiqət Hacıyeva, Səbail Rayon Veteran Təşkilatları Şurasının sədri, Sosialist Əməyi Qəhrəmanı Ömər Ağayev, Tələbə Gənclər Təşkilatının sədri Sahil Qələndərov, I kurs tələbəsi Aytac Fərzəliyeva və başqaları çıxış edərək mövzunun aktuallığı və əhəmiyyəti barədə fikirlərini bildirmişlər. İştirakçıların yüksək fəallığı ilə müşayiət olunan tədbirdə maraqlı təkliflər səslənmiş və səmərəli fikir mübadiləsi aparılmışdır.

Tədbir zamanı iştirakçılara məlumatlandırma vəsaitləri paylanılmışdır.

Tədbirə yekun vuran Elmi işlər üzrə prorektor, professor V.Əliyev ADPU-da belə maarifləndirici tədbirlərin gələcəkdə də keçirilməsinin vacibliyini bildirmişdir.

**Gülnar BƏXTİYARQIZI**

# “İnsan alverinin mahiyyəti, formaları, doğurduğu təhlükələr və onunla mübarizə” mövzusunda tədbir

Müasir dövrümüzdə bəşəriyyətin qarşısına çıxan böyükmiqyaslı faciələr yalnız müharibələr, ekoloji tarazlığın pozulması, ərzaq çatışmazlığı, təbii fəlakətlər və digər qlobal problemlərlə məhdudlaşmır. Hazırda müasir dünyamız üçün həm də transmilli mütəşəkkil cinayətlər sayılan narkotik vasitələrin qeyri-qanuni dövriyyəsi, silah alveri, terrorçuluq, adam oğurluğu, insan alveri, insan əməyinin istismarı və qanunsuz miqrasiya problemləri potensial təhlükə mənbəyi sayılır. Çox əfsuslar olsun ki, bəşəriyyət öz inkişafında keyfiyyətcə yeni mərhələyə daxil olsa da,  yuxarıda qeyd etdiyimiz təhlükə mənbələri öz miqyasını genişləndirərək, bəşəriyyət üçün böyük fəlakətlər törədir. Bu baxımdan, insan alveri cinayətləri şəxsiyyətin azadlığı və ləyaqəti əleyhinə olan cinayətlərdəndir. Bir faktı xüsusi qeyd etməyi vacib sayırıq ki, son illər respublikamızda transmilli mütəşəkkil cinayətkarlığın bir növü olan insan alveri cinayətlərinə qarşı ciddi və prinsipial mübarizə aparılır. Müstəqil Azərbaycan dövlətinin memarı və qurucusu, ümummilli liderimiz Heydər Əliyevin müdrik və uzaqgörən siyasi kursunu uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev bütün növ cinayətlərə qarşı olduğu kimi, insan alverinə qarşı mübarizənin də səmərəli təşkili üçün mükəmməl qanunvericilik bazasının yaradılmasına xüsusi diqqət yetirir. Qeyd edək ki, insan alverinə qarşı mübarizədə maarifləndirmə tədbirləri də mühüm rol oynayır. Bu il aprel ayının 16-da Təhsil Nazirliyinin (TN) və Daxili İşlər Nazirliyinin (DİN) İnsan Alverinə Qarşı Mübarizə Baş İdarəsi və İnsan Alverinə Qarşı Qeyri-Hökumət Təşkilatları Koalisiyasında təmsil olunan “Azərbaycan Uşaqları Birliyi” Qeyri-Hökumət Təşkilatının Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) “İnsan alverinin mahiyyəti, formaları, doğurduğu təhlükələr və onunla mübarizə” mövzusunda birgə keçirdikləri tədbir də bu baxımdan təqdirəlayiqdir.

ADPU-da“İnsan alverinin mahiyyəti, formaları, doğurduğu təhlükələr və onunla mübarizə” mövzusunda keçirilən tədbiri universitetin Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev açaraq qonaqları salamlamış və belə bir maarifləndirici tədbirin keçirilməsinin vacib olduğunu qeyd etmişdir. Professor R.Baxşəliyev bildirmişdir ki, təhsil və təlimlə yanaşı, məhz belə maarifləndirici tədbirlər tələbə-gənclərin düzgün tərbiyə olunmalarına, onların xalqımızın müqəddəs milli-mənəvi dəyərlərinə sadiq ruhda yetişmələrinə, bir sözlə, həyatda düzgün istiqamət götürərək, özlərini cəmiyyətdə əsl insan və ləyaqətli bir vətəndaş kimi təsdiqləmələrinə ciddi müsbət təsir göstərir.

Tədbirdə çıxış edən DİN-nin İnsan Alverinə Qarşı Mübarizə Baş İdarəsinin əməkdaşı, polis polkovnik-leytenantı Araz Babayev ilk olaraq tədbirin keçirilməsində göstərdiyi köməkliyə görə ADPU-nun rəhbərliyinə öz təşəkkürünü bildirmiş və tələbə-gənclərə uğurlar arzulamışdır. Araz Babayev öz çıxışında insan alverinin mahiyyəti, formaları, doğurduğu təhlükələr və bu transmilli mütəşəkkil cinayətkarlığa qarşı ölkəmizdə aparılan mübarizə haqqında ətraflı məlumat vermişdir. A.Babayev bildirmişdir ki, insan alveri güc tətbiq etmək hədəsi ilə və ya güc tətbiq etməklə və ya məcbur etmə, oğurlama, dələduzluq, aldatma, hakimiyyətdən və ya vəziyyətin zəifliyindən sui-istifadə etməklə, yaxud da digər şəxsə nəzarət edən şəxsin razılığını almaq üçün ödəniş və ya mənfəət vermək və ya aldatmaqla insanların istismar məqsədilə cəlb edilməsi, daşınması, təhvil verilməsi, gizlədilməsi və ya alınmasıdır. İstismar ən azı digər şəxslərin cinsi istismarını, icbari əməyi və ya xidmətləri, köləliyi, köləliyə bənzər adətləri, asılılıq vəziyyətini və ya orqanların çıxarılmasını nəzərdə tutur.  İnsan alveri - köləliyin müasir formasıdır. İnsan alveri latent cinayətlərə aiddir, yəni gizli qalan cinayətdir. İnsan alveri - insan hüquqlarının pozulması və şəxsiyyətə qarşı cinayətdir. İnsan alveri ağır cinayətdir. Qəddar və laqeyd münasibətlə insan hüquqlarının pozulması halları müşayiət olunur. Bu zaman insan manipulyasiya obyektinə çevrilir və onunla şəxsi əşya kimi davranılır. Əsasən qadınlar, gənc qızlar insan alverinin qurbanına çevrilirlər. Onları xaricdə təhsil, yüksək əməkhaqqı müqabilində iş və digər şirnikləndirici vədlərlə aldadaraq insan alverinin qurbanlarına çevirirlər. Azərbaycanlı qadınlar daha çox Türkiyə, Birləşmiş Ərəb Əmirlikləri, Pakistan, Rusiya, İran və digər ölkələrə aparılaraq orada insan alverinin qurbanlarına çevrilirlər.

A.Babayev öz çıxışında ölkəmizdə son illər insan alverinə qarşı mübarizənin prinsipial və səmərəli təşkili üçün qabaqcıl beynəlxalq təcrübəyə əsaslanan mükəmməl qanunvericilik bazasının yaradılmasına, müvafiq hüquqi-normativ aktların qəbul edilməsinə diqqəti xüsusi yönəltdi.  O, bildirdi ki, ölkəmizdə insan alverinə qarşı mübarizə üzrə 2004-2008 və 2009-2013-cü illəri əhatə edən iki Milli Fəaliyyət Planı qəbul olunmuş və icratı təmin edilmişdir. Yaxın vaxtlarda 3-cü Milli Fəaliyyət Planının qəbul edilməsi nəzərdə tutulur. Milli Fəaliyyət Planlarının icraçıları Nazirlər Kabineti, Daxili İşlər Nazirliyi, Xarici İşlər Nazirliyi, Milli Təhlükəsizlik Nazirliyi, Ədliyyə Nazirliyi, Səhiyyə Nazirliyi, Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi, Rabitə və Yüksək Texnologiyalar Nazirliyi, İqtisadiyyat və Sənaye Nazirliyi, Gənclər və İdman Nazirliyi, Mədəniyyət və Turizm Nazirliyi, Baş Prokurorluq, Dövlət Sərhəd Xidməti və Dövlət Gömrük Komitəsidir. 2005-ci ildə respublikamızda qabaqcıl beynəlxalq təcrübənin nəzərə alınması ilə hazırlanmış “İnsan alverinə qarşı mübarizə haqqında” Qanun qəbul edilmişdir. Bu Qanun insan alveri qurbanlarının hüquqlarının polis orqanları tərəfindən qorunmasına və onlara dəymiş mənəvi ziyanın məhkəmə yolu ilə ödənilməsinə təminat verir.



Ölkəmizdə insan alveri ilə bağlı cinayətlərin aşkar edilməsini və istintaqını DİN-nin İnsan Alverinə Qarşı Mübarizə Baş İdarəsi həyata keçirir. Bu Baş İdarə 2004-cü ildə yaradılıb. Azərbaycanda İnsan Alverinə Qarşı Mübarizə üzrə Milli Koordinator - Daxili İşlər Nazirinin müavini, polis general-leytenatı Vilayət Eyvazovdur. İnsan Alverinə Qarşı Mübarizə üzrə Milli Koordinator ildə bir dəfə Milli Məclisə və İnsan Hüquqları üzrə Müvəkkilə (Ombudsman) hesabat verir. DİN-nin İnsan Alverinə Qarşı Mübarizə Baş İdarəsinin 152 nömrəli “Qaynar xətt” xidməti fəaliyyət göstərir. Bu “Qaynar xətt” xidmətinin direktoru “Azərbaycan Uşaqları Birliyi” Qeyri-Hökumət Təşkilatının rəhbəri Günay İbrahimovadır. Bu xəttə günün 24 saatı ərzində zəng etməklə insan alveri ilə bağlı məlumatları çatdırmaq olar.  Məlumat üçün qeyd edək ki, 2013-cü ildə bu sahədə 238 cinayət faktı aşkar edilmişdir ki, bunun da 80-i insan alveri ilə bağlıdır. İnsan alveri cinayətlərinin bir növü də əməyin istismarıdır. Həyata keçirilmiş əməliyyat-axtarış tədbirləri nəticəsində ötən il məcburi əməklə bağlı 4 cinayət faktı aşkar edilmişdir.

Milli Fəaliyyət Planlarının həyata keçirilməsində qeyri-hökumət təşkilatlarının, həmçinin beynəlxalq təşkilatların iştirakı da nəzərdə tutulur. DİN-nin İnsan Alverinə Qarşı Mübarizə Baş İdarəsi qeyri-hökumət təşkilatları, ictimaiyyət nümayəndələri ilə səmərəli əməkdaşlıq edir. Hazırda bu Baş İdarənin insan alverinə qarşı mübarizədə əməkdaşlıq etdiyi İnsan Alverinə Qarşı Qeyri-Hökumət Təşkilatları Koalisiyasında 45 qeyri-hökumət təşkilatı təmsil olunur. İnsan alveri qurbanlarına bu Baş İdarənin tərkibində fəaliyyət göstərən “Təhlükəsizlik sığınacağı”nda yer verilir, onlara tibbi, psixoloji və hüquqi dəstək verilir, həmçinin onlara maddi yardım göstərilir. Yeri gəlmişkən, son 10 il ərzində DİN-nin İnsan Alverinə Qarşı Mübarizə Baş İdarəsi istər bu transmilli cinayətə qarşı mübarizə sahəsində əməliyyat-axtarış tədbirlərinin həyata keçirilməsi, istərsə də cəmiyyətdə profilaktik və maarifləndirici tədbirlərin aparılması baxımından uğurlu fəaliyyət göstərmişdir.

Görüşdə tələbə-gənclərə insan alverinə qarşı mübarizə ilə bağlı maarifləndirici bukletlər paylanılmışdır. Eyni zamanda Araz Babayev və “Azərbaycan Uşaqları Birliyi” Qeyri-Hökumət Təşkilatının rəhbəri Günay İbrahimova tələbələri maraqlandıran sualları ətraflı və dolğun cavablandırmışlar.

**Mənsur İBRAHİMLİ,**
**Mətbuat və informasiya şöbəsinin müdiri,**
**Azərbaycan Jurnalistlər Birliyinin üzvü**

# Fələstin Dövlətinin Azərbaycandakı fövqəladə və səlahiyyətli səfiri Nasser Abdel Kareem ilə görüş

Bu il aprel ayının 9-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Fələstin Dövlətinin Azərbaycandakı fövqəladə və səlahiyyətli səfiri cənab Nasser Abdel Kareem ilə görüş keçirilmişdir. Görüşdə əsasən Tarix fakültəsinin müəllimləri və tələbələri iştirak etmişlər.

Görüşü giriş sözü ilə açan ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru, dosent Mehdi Abdullayev qonağı salamlamış və tələbə-gənclərə görüşün məqsədi

barədə məlumat vermişdir. Dosent M.Abdullayev bildirmişdir ki,  cənab Nasser Abdel Kareemin tələbələrlə görüşü onun öz təşəbbüsü və rəsmi müraciəti əsasında keçirilir. Məqsəd ADPU-da təhsil alan tələbələrə Fələstin Dövlətinin yaranma tarixi, keçdiyi yol, xalqlarımız arasında əlaqələr və Fələstinin mövcud ictimai-siyasi vəziyyəti haqqında ətraflı və obyektiv məlumat verməkdir.

Fələstin Dövlətinin Azərbaycandakı fövqəladə və səlahiyyətli səfiri cənab Nasser Abdel Kareem ilk olaraq tələbə-gənclərlə belə bir görüşün keçirilməsinə göstərdiyi köməkliyə görə ADPU-nun rəhbərliyinə öz təşəkkürünü bildirdi. Cənab Nasser Abdel Kareem müəllim peşəsinin yüksək və şərəfli peşə olduğunu xüsusi qeyd etdi. O, öz çıxışını əsasən Fələstin Dövlətinin keçmişi və mövcud ictimai-siyasi vəziyyəti üzərində qurdu. Cənab səfir bildirdi ki, Fələstin xalqı ilə Azərbaycan xalqı arasında bir çox oxşar cəhətlər var. Tarix, din, mədəniyyət, mətbəx baxımından iki xalq arasında uyğun cəhətlər çoxdur. Onu da qeyd edək ki, Fələstinin müstəqilliyini dünyanın 140-dan çox ölkəsi tanımışdır. Son illər Azərbaycanla Fələstin arasında bir çox sahələrdə uğurlu əlaqələr qurulmuşdur. Fələstin ilə Azərbaycan beynəlxalq təşkilatlarda da həmrəylik nümayiş etdirirlər.

Cənab səfir çıxışına davam edərək bildirdi ki, Azərbaycan kimi Fələstin də hərbi təcavüzlə qarşılaşmışdır. Belə ki, XX əsrin əvvəllərindən başlayaraq Fələstin xalqı İsrail dövləti tərəfindən hərbi müdaxiləyə məruz qalmışdır. Bu hərbi müdaxilə İkinci Dünya müharibəsindən sonra daha geniş miqyas almışdır.

Cənab səfirin çıxışından o da məlum oldu ki, Fələstin ərazisində yaşayan əhalinin 70%-ni fələstinlilər, 30%-ni isə israillilər təşkil etmişdir. Lakin buna baxmayaraq, Birləşmiş Millətlər Təşkilatının (BMT) Təhlükəsizlik Şurası (TŞ) həmin ərazinin 56%-nin fələstinlilərə, 44%-nin isə israillilərə verilməsi haqqında qərar qəbul etmişdir. Lakin İsrail bununla kifayətlənməmiş və Fələstinə qarşı hərbi təcavüzü davam etdirmişdir. Nəticədə Fələstinin tarixi ərazilərinin 78%-i mərhələ-mərhələ İsrail dövləti tərəfindən işğal edilmişdir. Fələstin xalqı hazırda öz tarixi torpaqlarının yalnız 22%-də yaşayır. İsrail demək olar ki, Fələstin torpaqlarını işğal etməklə yanaşı, həm də bu ölkənin ərazisinin əksəriyyətinə nəzarət edir. Bu da öz növbəsində Fələstin xalqı üçün çoxsaylı problemlər yaradır. Fələstin xalqı öz ərazi bütövlüyünü bərpa etmək üçün ciddi mübarizə aparır. Lakin İsrail dövlətinin ədalətsiz mövqeyi və işğalçı siyasəti nəticəsində Fələstin xalqı öz ərazi bütövlüyünü təmin edə bilmir. Eyni zamanda dünyanın aparıcı dövlətlərinin və beynəlxalq təşkilatların İsrailin bu qanunsuz hərəkətlərinə göz yummaları da İsrail-Fələstin münaqişəsinin ədalətli həllinə mane olur. Baxmayaraq ki, BMT TŞ-sı İsrail-Fələstin münaqişəsinə dair 100-dən çox qətnamə qəbul edib, lakin bu qətnamələrin heç biri bugünədək İsrail dövləti tərəfindən icra edilməmişdir. İsrail beynəlxalq hüququn norma və prinsiplərinə əsla məhəl qoymur. Yeri gəlmişkən, BMT TŞ-sı Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin həllinə dair də 4 qətnamə qəbul etmişdir. Lakin işğalçı Ermənistanın qeyri-konstruktiv mövqeyi üzündən bu qətnamələrin heç biri icra edilməmişdir. 20 ildən artıqdır ki, Azərbaycanın ərazisinin 20%-i erməni işğalı altındadır. Beynəlxalq təşkilatların bu münaqişənin həllində də ikili standartlardan çıxış etmələri yalnız təəssüf və narazılıq hissi doğurur.





Görüşdə müəllim və tələbələri maraqlandıran suallar da cavablandırılmışdır.

**Gülnar SÜLEYMANOVA**
**Mətbuat və informasiya şöbəsinin əməkdaşı**

# Qala Tarix-Etnoqrafiya Qoruğunda bir gün

18 aprel dünyada Beynəlxalq Abidələr və Tarixi Yerlər günüdür. Bu günü 1983-cü ildə UNESCO yanında Tarixi Yerlər və Abidələrin Mühafizəsi Şurasının Beynəlxalq Assambleyası təşkil edib. Bu münasibətlə Bakı Şəhər Mədəniyyət və Turizm İdarəsinin tabeliyində olan mədəniyyət mərkəzlərinə, muzey və qoruqlara girişin pulsuz olacağı elan olunmuşdu. Hər il olduğu kimi, bu il də, "Açıq qapı" günü aprelin 18-nə təsadüf etdi.

Aprel ayının 18-də ADPU rəhbərliyinin təşkilatçılığı ilə Tarix, Fizika, Kimya, Biologiya, Filologiya fakültələrinin 2-3-cü tədris ilinin azərbaycanlı və türkiyəli tələbələri və YAP-ın ADPU Qadınlar şurasının sədri, dosent Laçın Həsənova, üzvləri Nigar Rəhimova, Səadət Mazanova, Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev və fotoqraf Əli Səmədovla birlikdə Qala Tarix-Etnoqrafiya Qoruğuna səyahət üçün toplandıq. Xüsusi ayrılmış avtobusla yola düşdük. 15-20 dəqiqəyə qoruq ərazisinə çatdıq.

Tez bir zamanda bizim üçün bələdçi ayrıldı. Bələdçi "danışan daşlar" haqqında geniş məlumat verdi.

Bundan sonra XVII-XVIII əsrlərə aid olan duluşçu evinin həyətinə daxil olduq. Həyətdə su quyusu, taxıl üçün zirzəmi və bir püstə ağacı da var idi. Bu ağacın 300 ilə yaxın yaşı olduğu güman edilir. Bələdçi həyətdə yerləşən evin arxeoloji qazıntılar zamanı bünövrəsinin tapıldığını və yenidən bərpa olunduğunu bildirdikdən sonra evin içinə daxil olduq. İçəridə nümaiş etdirilən əşyalar haqqında geniş məlumat verildi, tələbələrin sualları cavablandırıldı.

Daha sonra Arxeoloji Qalereyaya sarı irəlilədik. Qalereyaya gedən yolun üzərindəki kiçik bir quyu var idi. Tələbələrin bu "su quyusu" haqqında sualına bələdçimiz belə cavab verdi ki, bu quyu başqa bir yerdə yerləşən quyunun oxşarıdır. Qalereyanın tam yaxınlığında yerləşən digər quyu isə həqiqi su quyusudur.

Qalereyanın çölündə və içərisində maraqlı eksponatlar: üzərində insan təsvirləri olan qaya parçaları, küplər, saxsı qablar, müxtəlif bəzək əşyaları və s. nümayiş olunurdu. Burada olan eksponartlar o qədər diqqəti cəlb etdi ki, bələdçi dəfə müqəddəs torpaqlara ziyarət məqsədilə çıxan karvanlar vasitəsilə aparılıb Məkkədə, Mədinədə, Kərbəlada və s. dəfn olunurdu. Bu adətin İslam dininin doqmalarına zidd olub-olmadığını soruşduqda isə, bələdçi bunun cavabının uyğun olmadığını söylədi.

Ərazidə yerləşən ikimərtəbəli evə də baş çəkdik. Deyilənə görə, Qala kəndində ikimərtəbəli evlərin tikintisinə XIX əsrin sonlarından etibarən başlanılıb. Bu zamana qədərsə əsasən birmərtəbəli evlərdən istifadə olunub. Bu evin tikilişi də yaxın zamanlara aiddir. Burada diqqəti cəlb edən mühüm məqam mətbəxin evin içərisindən çıxarılması və ayrıca olaraq həyətdə tikilməsidir ki, bu da evin içinə müxtəlif qoxuların yayılmasına mane olur. Bu mətbəx, ekspedisiyada iştirak edən xanımların diqqətini daha çox cəlb etdi. Evin ikinci mərtəbəsinin xüsusi dizaynı isə hamının xoşuna gəldi. Belə ki, buranın bəzədilməsində milli ornamentlərdən, geniş istifadə olunmuşdur.

Bu evin ikinci mərtəbəsinin eyvanından məxsusi olaraq Qalada bəslənən



çi Cavid Ağayev ekskursiyanın başladığını elan etdi. Bundan sonra ərazisi 1.2 hektar olan muzey kompleksinə daxil olduq.

Bələdçimiz qoruğun 1988-ci il Nazirlər Kabinetinin qərarı ilə Qala qəsəbəsinin tarixi hissəsində yaradıldığını, açıq səma altında yerləşən bu muzeyinsə 6 il əvvəl təsis olunduğunu bildirdi. Bu muzeydə Abşeron rayonunda aşkar edilən arxeoloji və memarlıq abidələri toplanıb. Burada Azərbaycanın tarixi incilərini seyr etmək üçün hər cür şərait var.

İlk olaraq, müxtəlif minilliklərə aid arxeoloji tapıntılar diqqətimizi cəlb etdi. İbtidai insanların incəsənət nümunələri hesab olunan bu daşlar, qaya parçaları xüsusi altlıqların üzərində, məlumat lövhələri ilə bir yerdə öz tarixini və mədəniyyətini nümayiş etdirirdi. Bələdçimiz üzərində müxtəlif ov səhnələri, heyvan və insan təsvirləri olan və müxtəlif ibadət ayinləri üçün istifadə olunmuş bu dəmək olar ki, hər biri haqqında ayrıca məlumat verdi. Üzərində svasyika işarəsi olan və e.ə. III-II minilliklərə aid olduğu güman edilən saxsı qab parçası isə hamının heyrətinə səbəb oldu. Bu işarənin faşizmin simvolu olmasına baxmayaraq, tarixən bir çox xalqların mədəniyyətində təsadüf olunduğu və təbiət üzərində hakimlik, enerjinin idarə edilməsi kimi mənalandırıldığı vurğulandı. Müzakirə zamanı faşizmin mahiyyəti açıqlandı və pislənildi.

Muzeyin müxtəlif guşələrində ovdan, kurqan və sərdabə qəbirlərə rast gəldik. Bunlarla bağlı suallar ünvanladıq, müzakirələr apardıq. Sərdabə qəbirlər diqqətimi daha çox cəlb etdi. Bələdçimizin dediyinə görə, orta əsrlərdə vəfat edən şəxsin vəsiyyətinə əsasən, onun nəşi bu sərdabədə saxlanılır, ət çürüyərək torpağa qarışdıqdan sonra isə Qaladan ildə iki cins qoyunlar görünürdü. Bu qoyunlar öz ölçüsünə görə mənim indiyə kimi gördüklərimdən çox fərqlənirdi. Bu qoyunlar qaba yunlu, uzun qulaqlı və böyük ölçülü idilər. Bələdçinin dediklərinə görə, bu qoyunlar yalnız Qalada bu cür yetişə bilərlər. Təcrübə göstərib ki, başqa yerlərə aparılan zaman bu qoyunlar ya tələf olur, ya da cırlaşırlar. Az sayda qalan bu cins qoyunlar qoruqda xüsusi qorunur.

Bundan sonra muzeyin, müxtəlif əkinçilik və məişət əşyaları nümayiş olunan guşəsinə baş çəkdik. Sonra burada yerləşən dəmirçi emalatxanası ilə əyani tanış olduq. Bu emalatxanada at nalı, əkinçilikdə və məişətdə istifadə olunan əşyalar istehsal olunarmış. Dəmirçi emalatxanasından bir az aralıda isə dəni sünbüldən ayırmaq üçün istifadə olunan, bir neçə ədəd vəl düzülmüş geniş bir sahə görünürdü.

Sandıq qəbir daşlarına rast gəldiyimiz zaman bələdçinin verdiyi məlumatlar və Laçın xanımın etdiyi əlavələri çox maraqlı idi.

Muzeydə həm də qaval daşları nümayiş olunurdu. Ekskursiyada fəal iştirak edən tələbə Fəxri Heydərlinin qaval daşında ifa etməsi zamanı, bələdçimiz bu sirli daşların sirrini bizə açdı. Onun dediyinə görə, bu daşlar balıqqulaqlarının uzun illər bir yerdə sıx birləşib daşlaşması nəticəsində yaranır. Arada qalan kiçik boşluqlar, bu daşlara endirilən zərbələr zamanı xüsusi səslənməyə səbəb olur. Bu daşlara yaxından bələd olan ibtidai insanlar, məhz bunun sayəsində ilk ritmləri ifa etmişlər.

Həmin guşədə yerləşən digər abidələrlə tanış olduqdan sonra Açıq Səma Altında Muzey kompleksindəki ekskursiyanı yekunlaşdırıb, Əntiq Əşyalar Muzeyinə üz tutduq.

Bu muzey Şahid Həbibulayevin şəxsi kolleksiyası əsasında yaradılmışdır. Burada xalqımızın əsrlər boyu yaratdığı və dünyanın müxtəlif yerlərində istehsal olunmuş dekorativ-tətbiqi incəsənət nümunələri, məişət əşyaları, silahlar, ticarətdə və istehsalatda istifadə olunan əşyalar sərgilənirdi. Bu əşyaların hər biri orijinallığı ilə o qədər seçilirdi ki, onların hər biri haqqında məxsusi olaraq öyrənmək istəyirdin...

Bu eksponatların hər birinin ətrafında uzun müzakirələr olur, fikir mübadilələri aparılırdı. Bu müzakirələr ekskursiya iştirakçılarını keçmiş dövrlərə xəyali olaraq səyahət etməyə sövq edirdi.

Əntiq Əşyalar Muzeyini ziyarət etdikdən sonra qoruq ərazisində yerləşən və möhtəşəm tikili olan istehkam qalasına daxil olduq. Bu qala XII əsrə aiddir. Bir hissəsi dağıntılara məruz qalmış bu qala 2010-cu ildə bərpa olunmuşdur. Qalanın daxilində, həmçinin qazıntılar zamanı aşkarlanan müxtəlif eksponatlar nümayiş olunurdu. Burada kiçik bir mehrab da mövcud idi. Qalanın əzəməti, ekskursiya iştirakçılarını sanki ovsunlamışdı. Hamı özünü orta əsrlərdəymiş kimi hiss etdiyini etiraf edirdi. Kimisi özünü şahzadəyə, kimisi cəngavərə, kimisisə xana bənzədirdi. Taxta pilləkənlərlə qalanın qülləsinə qalxdıq. Bələdçinin dediyinə görə, əvvəllər qüllənin aşağı mərtəbələrində pilləkənlər olmayıb. Yuxarı mərtəbələrə əvvəlcə kəndirlə, sonra isə divarlara hörülmüş pilləkənlərlə qalxmaq mümkün imiş. Bundan məqsəd, qalaya daxil olmuş düşmənin yuxarı mərtəbələrə qalxmasına mane olmaq idi. Çünki qüllənin itirilməsi qalanın itirilməsi hesab olunurdu.

Qüllədən bütün qoruq ərazisi görünürdü. Göl, yaşayış evləri, orta məktəb, hamamlar, bir az əvvəl ziyarət etdiyimiz muzeylər və.s tam görünürdü.

Bundan sonra qalanın arxa tərəfindəki qədim yaşayış məskəninin qalıqlarına tamaşa etdik. Bələdçinin dediyinə görə, qazıntılar nəticəsində tapılan bu divar qalıqları qalanın tikilməsindən minillər əvvələ təsadüf edir.

Ekskursiyamızı burada yekunlaşdırdıq. Bələdçimiz Cavid Ağayevlə dərin təşəkkürlərimizi bildirdik.

Keçirdiyim bu gün həyatımda ən əvəzolunmaz günlərdən biri oldu. İnanıram ki, digər ekskursiya iştirakçıları da mənim kimi düşünürlər. Bu cür ekskursiyalar hər bir müəllimin, hər bir tələbənin, hər bir insanın dünyagörüşünün formalaşmasında mühüm əhəmiyyətə malikdir.

Belə bir deyim var: "Keçmişini bilməyən gələcəyini qura bilməz". Bunun nə qədər doğru olduğunu müzakirə etmək istəmirəm, amma düşünürəm ki, keçmişini bilmək hər bir vətəndaşın ən başlıca vəzifəsi olmalıdır, xüsusilə də müəllimlərin. Əcdadlarının hansı tarixi mərhələləri keçməsi, təkamül prosesi nəticəsində hansı prolemlərlə üzləşib, hansıları adlaya bilib bilməməsini öyrənən müəllim gələcəkdə öz şagird və tələbələrinin inkişafı yolunda daha məsuliyyətli olacaq. Bu borcu vicdan və şərəflə yerinə yetirməyə hər zaman hazır olacaq.

Bir millətin gələcəyini təsəvvür etmək üçün onun bugünki müəllimlərinə baxmaq kifayətdir. Əgər müəllimlər kifayət qədər bilikli, ixtisaslı, dünyagörüşlü, intellektual, vicdanlı və məsuliyyətli olsalar, gələcək nəsillər də bir o qədər sağlam və yararlı olarlar. Gələcək dünyanın maksimum ədalətli, gələcək insanların maksimum firəvan yaşamasını təmin etmək, müəllimlərin ən başlıca vəzifəsidir. Buna görə də bilikləri artırmaq başlıca şərtdir.

Bu ekskursiyanın təşkilində əməyi olan hər kəsə təşəkkürümü bildirirəm və bu cür tədbirlərin davamlı olacağını güman edirəm.



**İsgəndər Bababəyli,
Filologiya fakültəsinin
III kursunun
306-cı qrup tələbəsi**

# AZƏRBAYCAN TƏHSİLİNDƏ PEŞƏ ORIYENTASIYASI

## *ADPU bu istiqamətdə səmərəli fəaliyyət göstərir*

Bu gün Azərbaycanın təhsil sahəsində ən mühüm məsələlərdən biri də gənclərin peşə oriyentasiyasıdır. Qeyd edək ki, Təhsil Nazirliyində aprel ayının 3-də bu məsələ ilə bağlı mətbuat konfransı keçirilmişdir. Konfransda "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"-na uyğun olaraq ali təhsil sahəsi üzrə elan olunmuş prioritet islahatlarda abituriyentlərin peşəyönümlü ixtisasseçimi mexanizminin formalaşdırılmasının, təhsilin müxtəlif səviyyələri arasında varislik və təhlükəsizlik prinsiplərinin təmin edilməsinin mühüm amil kimi nazirliyin diqqət mərkəzində saxlanıldığı bildirilmiş, bu prinsipi əldə rəhbər tutaraq, abituriyentlərin ixtisasseçiminə dəstək məqsədilə ali təhsil müəssisələri tərəfindən "İxtisasseçimi" adlı maariflendirici kampaniya keçirilməsi məqsədəuyğun hesab edilmiş, keçiriləcək tədbirlərin abituriyentlərin ixtisasseçimi məsələsində həlledici əhəmiyyət daşımaqla bərabər onların gələcək əmək fəaliyyətlərini və karyera uğurlarını müəyyənləşdirəcəyi də qeyd olunmuşdur.

Respublikamızda ali pedaqoji təhsilin öncülü olan ADPU-da da bu konfransda irəli sürülən məsələ ilə əlaqədar konkret işlər görülməsinə başlanılmışdır. Belə ki, ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun müvafiq əmri ilə "ADPU-nun 2013-2014-cü tələbə qəbulu ilə əlaqədar peşə oriyentasiyası ilə bağlı tədbirlər planı" təsdiq edilmişdir. Bu əmrə əsasən hər fakültənin professor-müəllim heyətindən ibarət qruplar yaradılaraq həmin fakültə tələbələrinin pedaqoji təcrübədə olduqları məktəblərin yuxarı sinif şagirdləri ilə görüşlər keçirilir, qəbul imtahanlarına qatılacaq gənclərin öz peşə seçimlərində yanlış addım atmamaları üçün həyati faktlara istinad edilərək onlara məsləhətlər, tövsiyələr verilir. Onu da qeyd edək ki, ADPU-nun professor-müəllim heyətinin və tanınmış məzunlarının 2013-2014-cü tədris ilində tələbə qəbulu ilə əlaqədar Bakı şəhərinin müxtəlif məktəblərində keçirdikləri görüşlər həm də Pedaqoji Universitetdə olan ixtisasları təbliğ etmək məqsədinə xidmət edir.

Aprel-may aylarını əhatə edən tədbirlər planına görə, aprel ayının 23-də Tarix fakültəsinin professor-müəllim heyəti Bakının Nərimanov rayonundakı 34№li məktəbdə, Biologiya fakültəsi Səbail rayonundakı 49№li liseydə, aprel ayının 25-də Pedaqoji fakültə Nəsimi rayonundakı 211№li, Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsi Xətai rayonundakı 269№li, Kimya fakültəsi Xətai rayonundakı Heydər Əliyev adına liseydə, aprel ayının 29-da Filologiya fakültəsi Xətai rayonundakı 138№li məktəbdə, aprelin 30-da isə Pedaqogika və psixologiya fakültəsinin professor-müəllim heyəti və tələbələri Nərimanov rayonundakı 36№li məktəbdə olmuş, adıçəkilən məktəb və liseylərin buraxılış sinif şagirdləri ilə görüşlər keçirmişlər. Görüşlərdən hazırlanmış yazıları təqdim edirik.

(Davamı 6-cı səhifədə)

# Tarix fakültəsinin kollektivi 34 nömrəli tam orta məktəbdə

(Əvvəli 5-ci səhifədə)

Aprel ayının 23-də "ADPU-nun 2013-2014-cü tədris ilində Tələbə qəbulu ilə əlaqədar Peşə oriyentasiyası ilə bağlı Tədbirlər planı"na müvafiq olaraq ADPU-nun Tarix fakültəsinin professor-müəllim heyəti və məzunlarının Nərimanov rayonundakı 34 nömrəli tam orta məktəbin buraxılış siniflərinin şagirdləri ilə görüşü keçirildi. Görüşü giriş sözü ilə açan məktəbin direktoru Rəhman Hacıyev Tarix fakültəsinin əməkdaşlarını təqdim etdi və onların bu təşəbbüsünü yüksək dəyərləndirdiklərini bildirdi.

Tarix fakültəsinin dekan müavini, dosent Nazir Əsədov ilk çıxış edərək fakültə haqqında, ixtisaslar və tədris heyəti barəsində, eləcə də inkişaf etməkdə olan ölkəmizin təhsil sahəsində aparılan islahatlardan, yeni peşələrdən məlumat verərək bildirdi ki, hazırda Tarix fakültəsində təhsil alan tələbələr həm tarix müəllimliyi, həm də coğrafiya müəllimliyi ixtisasları üzrə ixtisaslaşmaq imkanına malikdirlər.

Pedaqogika üzrə elmlər doktoru, professor Mübariz Əmirov çıxış edərək şagirdlərin peşə seçimində Tarix fakültəsinin üstünlüklərindən, bu ixtisasa yiyələnənlərin təhsil sahəsindən başqa həm də hüquq-mühafizə orqanlarında da çalışmaq imkanı əldə edəcəkləri barədə məlumat verdi. Professor M.Əmirov son illərdə əməkdaşlarımızın 12 monoqrafiya, 13 dərs vəsaiti, 15 proqram cap etdirdiyini bildirdi. Tarix fakültəsinin dekanı, tarix üzrə elmlər doktoru, professor Oqtay Sultanovun, professor Mais Əmrahovun, dosent Qabil Bəşirovun onunla birlikdə Təhsil Nazirliyi nəzdində fəaliyyət göstərən Elmi-Metodik Şuranın üzvləri olduqlarını diqqətə çatdırdı. Eyni zamanda qeyd etdi ki, şagirdlər bu gözəl kollektivdə təhsil almaq qərarına gəlsələr, uğur qazana bilərlər.

Şərqi Avropa və türk xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının müdiri, tarix üzrə fəlsəfə doktoru, dosent Rəcəb Əliyev çıxışında kafedranın professor-müəllim heyəti,onların elmi yaradıcılığı barəsində şagird kollektivini məlumatlandırdı. Professor Oqtay Sultanovun "Orta əsrlər tarixi.Didaktik materiallar. 7-ci siniflər üçün dərs vəsaitinin (Bakı-2008)", "Qədim dünya tarixi. Didaktik materiallar. 6-cı siniflər üçün dərs vəsaitinin (Bakı-2010)", professor M.Əmirovun "Azərbaycan Respublıkası Konstitusiyasının əsasları" (Bakı-1996), 8-9-cu siniflər üçün "İnsan və cəmiyyət" (Bakı-1996) dərsliklərinin müəllifləri olduqlarını bildirdi. Dosent R.Əliyev Tarix fakültəsinin məzunlarının arasında görkəmli şəxsiyyətlərin, dövlət xadimlərinin və elm adamlarının olduğunu bildirdi. Məzunlarımız hazırda bır çox universitetlərdə, idarə və nazirliklərdə, hüquq-mühafizə orqanlarında aparıcı mütəxəssislərdəndir.

Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Tahir İsgəndərov çıxışında tədrisdəki metodik yeniliklərdən, müəllim peşəsinin çətinliklərindən və çətin olduğu qədər də şərəfli olduğundan bəhs etdi. Dosent T.İsgəndərov bugünkü şagirdlər arasında gələcəyin gözəl müəllimləri olmaq arzusunda olanların yetişdiyinə ümid etdiyini bildirdi və bu sahədə onlara müvəffəqiyyətlər arzulayaraq lazımi yardımlarını əsirgəməyəcəklərini vurğuladı.



Kafedranın baş müəllimi Əfqan Musayev özünün də bu fakültənin məzunu olduğunu və bu mərhələyə yüksəlməsində professor-müəllim heyətinin əvəzsiz rolunun olduğunu bildirdi. O, pedaqoji fəaliyyətlə yanaşı, digər fəaliyyət növləri ilə də məşğul olarkən, pedaqoji təhsilin kollektiv idarəçilik sahəsindəki üstünlüklərindən danışdı. Müəllimin insan psixologiyasını gözəl bilməsi onun həm siyasi, həm də inzibati-təsərrüfat sahəsində də rəhbərlik qabiliyyətinin formalaşmasına səbəb olur. Ə.Musayev Türk xalqları arasında geniş əməkdaşlığın yaradılması sahəsində bu xalqların tarixinin, mədəniyyətinin, coğrafiyasının öyrədilməsi və gənc nəsillərin bu ruhda tərbiyə edilməsində bugünkü və gələcək müəllimlərin üzərinə böyük məsuliyyət düşdüyünü bildirdi. Bu istiqamətdə pedaqoji kadrların hazırlanması qarşıda duran ən ümdə məsələlərdən biridir. Belə ixtisaslaşma nəinki Azərbaycanda, bütün türkdilli ölkələrdə tədris olunmaqdadır. Bu sahədə elmi əməkdaşlıq və mübadilə proqqamları çərçivəsində tələbələrin başqa ölkələrin də ali məktəblərində təhsil almaq,daha çox bilik və təcrübələr əldə etmək imkanı olmaları barəsində məlumat verildi.

Sonda şagirdləri maraqlandıran suallar cavablandırıldı.

**Əfqan Musayev,**
**Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının baş müəllimi**

# Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin kollektivi 269 nömrəli tam orta məktəbdə

Tanışlıq üçün bildirək ki, bu il 269 nömrəli tam orta məktəbin fəaliyyətə başlamasının 30 ili tamam olur. Məktəbə ilk gündən Ala Vəzirova rəhbərlik edir. Adıçəkilən təhsil müəssisəsi özünəməxsus ənənələri ilə həmişə diqqət mərkəzində olub, o cümlədən tələbə həyatında pedaqoji təcrübə kimi vacib bir məqsədin həyata keçirilməsində də. Universitetimizin Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin tələbələri uzun illərdir pedaqoji təcrübələrini bu məktəbdə keçirlər. Məktəbin rəhbərliyi həmişə tələbələrimiz üçün lazımi şərait yaradıb, onlara sözün həqiqi mənasında qayğı, doğmalıq göstərib. Bu mövzudan söz düşəndə direktor A.Vəzirova deyir ki, əgər tələbələr ilk günlər siniflərə tərəddüdlə girirdilərsə, bir aylıq pedaqoji təcrübə müddəti başa çatandan sonra onlarda özünə inam, sözün həqiqi mənasında öz müəllimlik işindən zövq alan yetkin müəllim təəssübkeşliyi duyursan.



Tələbə qəbulu ilə əlaqədar peşə oriyentasiyası ilə bağlı aprel ayının 25-ində keçirilən görüşün iştirakçıları da eyni isti, doğma münasibətlə qarşılaşdılar. Tədbiri giriş sözü ilə məktəbin direktoru A.Vəzirova açdı. Akt zalına toplaşmış yuxarı sinif şagirdlərinə qonaqlar haqqında, onların universitetə gəlişlərinin məqsədi barədə məlumat verdi.

Fakültənin müəllim və tələbələrini şagirdlərə 269 nömrəli məktəblə tez-tez ünsiyyətdə olan İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrasının dosenti Yunis İsmayılov təqdim etdi. Şagirdlər Yunis müəllimin çıxışından öyrəndilər ki, görüşdə fakültənin dekanı, dosent Mətanət Əsgərova, dekan müavini, baş müəllim Məsim Quliyev, Fiziki coğrafiya və ekologiya kafedrasının müdiri, coğrafiya elmləri doktoru Məhəmməd Abduyev, baş müəllim, metodist Kamal Əkbərov, Ümumi pedaqogika kafedrasının dosenti Kəmalə Quliyeva, İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrasının dosenti, metodist Oqtay Alxasov, fakültənin gənc məzunu, hazırda müəllimi olan Leyla Əliyeva, baş müəllim, pedaqoji təcrübə rəhbəri Nəzakət Zeynalova, fakültənin üçüncü kurs tələbəsi, universitet Tələbə Gənclər Təşkilatının sədri Sahil Qələndərov, adıçəkilən məktəbdə pedaqoji təcrübədə olan 301-ci qrupun tələbələri və digər kurslardan tələbələr iştirak edirdilər.

Görüşün məqsəd və məqamı barədə fakültənin dekanı, dosent M.Əsgərova açıqlama verdi. Şagirdlər M.Əsgərovanın çıxışından ADPU-nun yaranma tarixi, universitetdə fəaliyyət göstərən fakültələr, hazırlanan ixtisaslar barədə mükəmməl bilgi əldə etdilər: "Universitetə 2006-cı ilin aprelindən tanınmış alim və ziyalı, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, "Şöhrət" ordenli, fizika-riyaziyyat elmləri doktoru, professor Yusif Məmmədov rəhbərlik edir. Onun rəhbərliyi ilə ADPU-da bir çox yeniliklər həyata keçirilmiş, şəffaflıq, haqq-ədalət yerini tapmışdır. Fakültəmizdə də öz peşəkarlığı ilə diqqət çəkən, müəllim adının şərəf və ləyaqətini uca tutan professor-müəllimlərimiz çoxdur. Fakültənin kadr potensialını gücləndirmək məqsədi ilə rektor Y.Məmmədovun AMEA-dan, müxtəlif nazirlik və idarələrdən cəlb etdiyi sayılıb-seçilən mütəxəssislər öz zəngin təcrübələrini gələcəyin müəllimlərinə böyük həvəs və şövqlə öyrədirlər".

Dekan M.Əsgərova bu göstəriciləri sadalamaqla 269 nömrəli tam orta məktəbin gələcəkdə müəllim olmaq arzusunda olan şagirdlərinin hansı səviyyəli müəllimlərdən dərs alacaqlarını bildirmək istəmişdir.

M.Əsgərovanın çıxışında fakültədə fəaliyyət göstərən kafedralar, çalışan müəllimlər, müəllimlərin elmi dərəcələri haqqında mükəmməl bilgi verilmişdir.

Pedaqoji işi, müəllim sənətini sevənlər, ömrünü bu işə həsr edənlər fədakar insanlardır. Onlar öz biliklərini ölkəmizin gələcəyini etibar edəcəyimiz nəslə öyrətməkdən həzz alırlar, - demişdir M.Əsgərova, - müəllim adı bütün zamanlarda, bütün əsrlərdə həmişə uca tutulub, bu ad sahibinə həmişə ehtiram, diqqət, hörmət göstərilib. Sizinlə görüşə gələn müəllimlər instituta sənəd verməzdən hələ xeyli əvvəl müəllim sənətinə marağı, sevgisi olan şəxslərdir ki, indi hamısı dissertasiya müdafiə edib fəlsəfə doktoru, yaxud elmlər doktoru kimi yüksək elmi adlara, bu adların insana qürur gətirdiyi nüfuza, hörmətə sahib olublar. Ulu öndər Heydər Əliyev "Mən müəllimdən yüksək ad tanımıram"-demişdir. Axı müəllimlik - ən uca peşədir. Həyatda istənilən peşə-sənət sahibini müəllim yetişdirir. Təhsil Naziri cənab Mikayıl Cabbarov müəllim peşəsinə olan hörmətinin təzahürü kimi 2013-2014-cü tədris ilinin başlanğıcında pedaqoji kadr hazırlığı ilə məşğul olan ADPU-ya gəlmiş, müəllim və tələbələrimizlə görüşmüş, onları Təhsil Nazirliyinin Azərbaycanın təhsil siyasətində gözlənilən yenilikləri ilə tanış etmişdir.

Dosent M.Əsgərova Təhsil Nazirliyinin gündəmə gətirdiyi tələbə qəbulu işində peşə oriyentasiyası və eyni zamanda ali məktəb məzunlarının onların seçdikləri ixtisas üzrə işləməməsi problemi üzərində xüsusi dayanmışdır: "ADPU bir çox istiqamətlər üzrə müəllim hazırlığı ilə məşğul olur. Müəllimlik - gözəl sənətdir, bütün zamanlarda sayılıb-seçilən, xüsusi nüfuza, hörmətə malik olan sənətdir. Axı müəllim - öyrədən deməkdir, Vətənin gələcək qurucularını yetişdirib-hazırlayan deməkdir. Bu adın sahibinə məhz bu məziyyətlərinə görə tarixən sevgi, ehtiram bəsləmişlər. Ancaq təəssüf ki, müəllim ixtisası üzrə təhsil alan, hətta xüsusi təqaüdlə oxuyan, fərqlənmə diplomu ilə universiteti bitirənlər arasında da müəllimlik işindən ayrılıb başqa sahələrdə çalışanlar var. Ölkəmizdə hazırda müəllim kadrları hazırlığı ilə məşğul olan xeyli sayda ali təhsil müəssisələri fəaliyyət göstərir, hər il minlərlə tələbə müəllim diplomuna yiyələnir. Amma amma respublikamızın kənd rayonlarında müəllim kadrları çatışmır. Bu hal təəssüf hissi doğurur. Bu görüşü keçirməkdə məqsədimiz budur ki, müəllimliyə gələn abituriyentlər, həqiqətən, bu sahəyə xüsusi marağı, məhəbbəti, istəyi olan şəxslər olsunlar. Siz şagirdlər arasından məqsədsiz-məramsız seçim edənlər yox, müəllim işinə marağı olanlar Pedaqoji Universitetə gəlsinlər. Yalnız belə olan halda müəllim peşəsinə yiyələnənlər başqa sahələrə getməz, öz ixtisasları üzrə işləyərlər.

Sonra çıxış edənlər - dekan müavini M.Quliyev, kafedra müdiri M.Abduyev, baş müəllim K.Əkbərov, dosentlər K.Quliyeva, O.Alxasov və digərləri müəllimlik arzularına necə qovuşduqlarından söz açmış, bu mövqeli çıxışları ilə buraxılış siniflərində təhsil alan məktəbliləri peşə oriyentasiyası məsələsində səhv etməməyə çağırmışlar. Dosent K.Quliyeva çıxışında demişdir: "Mən orta məktəbi medalla bitirmiş, Pedaqoji Universitetdə o dövrün ən yüksək təqaüdü olan Lenin təqaüdü ilə oxumuşam. Tələbəsi olduğum Coğrafiya fakültəsində çox sevimli müəllimlərim olub. Mənim müəllimlik sənətinə daha sıx bağlanmağıma məhz onlar səbəb olublar. Bu gün də mənə dərs demiş olan Bəyim müəlliməni görəndə özümü onun tələbəsi bilirəm, onun məsləhətlərinə, tövsiyələrinə ehtiyac duyuram. Rəssam üçün rəng duyumu, bəstəkar üçün musiqi duyumu nə qədər vacibdirsə - müəllim üçün də pedaqoji duyum bir o qədər vacibdir. Müəllim olmaq üçün başlıca şərtlərdən biri də uşağı sevməkdir. Müəllimlik insanın içindən süzülüb gəlməlidir ki, bu mürəkkəb, ağır, həm də şərəfli olan işin öhdəsindən layiqincə gələ biləsən".

Məktəblərdə kişi müəllimlərin çatışmaması problemindən bəhs edərkən dosent K.Quliyeva demişdir: "Ata nüfuzu ailədə nə qədər vacibdirsə, belə hesab edirəm ki, məktəbdə də kişi müəllimlərinin nüfuzu bir o qədər vacibdir. Odur ki, ürəyində müəllimlik sənətinə meyli olan gənc oğlanları Pedaqoji Universitetə təhsil almağa dəvət edirəm. Siz burada respublikamızın tanınmış pedaqoq və psixoloqlarının qayğı və məhəbbəti ilə əhatə olunacaq, müəllimlik işinin sirlərinə yiyələnəcəksiniz".

***

Tədbirin sonunda Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin dekanı, dosent M.Əsgərova və 269 nömrəli tam orta məktəbin direktoru A.Vəzirova buraxılış sinif şagirdlərini peşə seçimlərində diqqətli olmağa, müəllimlik işinə meyli olan oğlan və qızları Pedaqoji Universitetdə təhsil almağa dəvət etdilər.

**A.Ziyad**

# Pedaqoji fakültənin kollektivi Akif Abdullayev adına 211 nömrəli tam orta məktəbdə




Bakının Nəsimi rayonundakı Akif Abdullayev adına 211 nömrəli tam orta məktəbin yuxarı sinif şagirdləri ilə ADPU-nun Pedaqoji fakültəsinin professor-müəllim heyəti və tanınmış məzunları ilə görüşünü məktəbin direktoru Vaqif Babayev açmış, bir vaxtlar özünün də tələbəsi olduğu Pedaqoji Universitetdə ona dərs demiş müəllimlərini və tələbə yoldaşlarını rəhbərlik etdiyi təhsil müəssisəsində görməkdən məmnun olduğunu söyləmişdir. V.Babayevin çıxışından məlum olmuşdur ki, o kafedra müdirləri, professorlar İramin İsayevlə Seyidağa Həmidovdan dərs almış, Pedaqoji fakültənin dekanı, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmovla tələbə yoldaşı olmuşdur. Görüşdə həmçinin kafedra müdirləri, professorlar Minarə Dadaşova və Jalə Qədimova, Zahid Xəlil, İbtidai siniflərdə rus dili kafedrasının professoru Eldar Abbaszadə, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Yaqut Rzayeva, Təhsil Problemləri İnstitutunun professoru Vidadi Xəlilov və başqaları iştirak edirdilər. Bütün bunlar barədə dolğun məlumat verən məktəbin direktoru V.Babayev ADPU-nun "İbtidai sinif müəllimliyi" və "Musiqi müəllimliyi" ixtisaslarının təqdimatı" mövzusunda çıxış etmək üçün sözü Pedaqoji fakültənin dekanı, professor Fərrux Rüstəmova vermişdir.

Professor F.Rüstəmov geniş məzmunlu çıxışında respublikamızda 1921-ci ildə 6 tələbə ilə fəaliyyətə başlamış pedaqoji kadrlar hazırlayan ilk ali məktəbin keçdiyi fəaliyyət yolundan söz açmış, ölkəmizdə pedaqoji təhsilin əsasını qoyan, onu elm səviyyəsinə çatdıran görkəmli elm və təhsil xadimlərinin şərəfli əməklərindən bəhs etmiş, fəaliyyət göstərdiyi 93 ildə ADPU-nun 150 mindən artıq müəllim hazırladığını söyləmişdir. 50 yaşını arxada qoymuş Pedaqoji (zamanında İbtidai təhsilin pedaqogikası və metodikası) fakültəsinin 1958-1959-cu tədris ilində təşkil edildiyini, hazırda fakültədə əyani şöbədə 712, qiyabi şöbədə 377, ümumillikdə 1089 tələbənin təhsil aldığını söyləmişdir. Fakültədə tam orta məktəblər üçün "İbtidai sinif müəllimliyi" və "Musiqi müəllimliyi" ixtisasları üzrə müəllimlər hazırlandığını, 5 kafedranın (İbtidai təhsilin pedaqogikası və metodikası, Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası, İbtidai siniflərdə rus dili, Musiqi fənləri və onun tədrisi metodikası və Musiqi alətləri fənlərinin tədrisi metodikası), Həmkarlar İttifaqı Komitəsi, Tələbə Həmkarlar İttifaqı Komitəsi və Tələbə Gənclər Təşkilatı kimi ictimai qurumların fəaliyyət göstərdiyini, fakültədə 15 nəfər elmlər doktoru-professorun, 41 nəfər fəlsəfə doktorunun, 49 nəfər baş müəllim və müəllimin çalışdığını demiş, fakültənin həyatda uğur qazanmış məzunlarından, müəllim-tələbə münasibətlərindən söz açmışdır: "Müəllimlərimizin tələbələrimizlə elə gözəl münasibətləri var ki, onlar tələbələrini öz övladları qədər sevirlər. Tələbənin biliyinin qiymətləndirilməsi sahəsində universitetimizdə olduqca saf, sağlam mühit yaradılıb. Belə ki, kollokviumlarda balların yığılması və imtahanların aparılması birbaşa İKT vasitəsilə həyata keçirilir. Aldığınız qiymət müəlliminizdən də, dekandan da əvvəl, elə imtahanı başa çatdıran andaca sizin özünüzə məlum olur. Respublikamızın bütün ali məktəblərində, o cümlədən ADPU-da da tələbələr kredit sistemi ilə təhsil alırlar. Bu, o deməkdir ki, hər hansı fəndən "qeyri-müvəffəq" qiymət almış olsa da, tələbə universitetdən xaric olunmur. Növbəti dərs ilində öz kurs yoldaşları ilə dərslərini davam etdirməklə yanaşı, "qeyri-müvəffəq" qiymət almış olduğu fənni aşağı kursun tələbələri ilə keçir. Belə tələbələrin akademik borclarını ləğv etmələri üçün yay imtahan semestri də təşkil olunur. Bu isə o deməkdir ki, tədris ili başa çatdıqdan sonra tələbə onlar üçün ayrılmış müəllimlər vasitəsi ilə bir ay dərs keçir, müəyyən edilmiş vaxtda imtahan verib akademik borcunu ləğv edir.

Tələbələrimiz elə bir atmosferdə təhsil alırlar ki, Vətən üçün, xalq üçün, ailələri üçün layiqli övlad olsunlar. Bu duyğuları tələbələrimizdə formalaşdırmaq üçün onların Azərbaycanın gəzməli-görməli yerlərinə, tarixin yaddaşını özündə yaşadan ünvanlara, muzeylərə ekskursiyalarını təşkil edirik ki, belə tədbirlər tələbə-gənclərimizin dünyagörüşünün daha da genişlənməsinə, onların vətəndaş mövqeyinin formalaşmasına yardımçı olur. Çünki bizim, eləcə də orta məktəb müəllimlərinin birinci vəzifəsi yaxşı övlad, yaxşı şəxsiyyət, yaxşı valideyn yetişdirməkdir. Yaxşı valideyn olmaq üçünsə lazımdır ki, yaxşı oxuyasan, təhsil alasan, dünyanın işlərindən baş çıxarasan. Ulu öndər Heydər Əliyev "Mən müəllimdən yüksək ad tanımıram"-demişdir. Mən inanıram ki, siz müəllim adını, müəllim şərəfini özünüz üçün həyat yolu seçib bizim Pedaqoji Universitetin tələbəsi olacaq, gələcəyin layiqli müəllimləri olacaqsınız. Çünki həyat daim hərəkətdədir, inkişafdadır. Bununla demək istəyirəm ki, zamanı yetdikcə nəsillər bir-birini əvəz edir. Bizim müəllimlərimiz olub, onları indi bizlər əvəz edirik, zaman gələcək bizləri də sizlər əvəz edəcəksiniz".

Müəllim adının böyüklüyü, ucalığı, şərəfi professor F.Rüstəmovun bütün çıxışı boyu leytmotiv kimi səslənmişdir. Müdriklərdən birinin kəlamını məktəblilər üçün məsəl kimi dilə gətirən natiq demişdir: "Müdriklərdən birindən soruşurlar ki, atanı daha çox sevirsən, yoxsa müəllimini? Cavab verir ki, müəllimimi! Cavabını belə əsaslandırır: Atam məni göydən yerə endirdisə, müəllimim məni yerdən göyə qaldırdı. Bir də deyirlər ki, yunanlını yunanlı edən onun yunanlı olması deyil, aldığı təhsildir. Müəllim şagirdinin qəlbinə elə bir nur, işıq salır ki, o yaxşını-yamandan, əyrinidüzdən seçə bilir. Buna görə də müəllimlər hörmətə və ehtirama layiqdirlər. Məhəmməd Peyğəmbər deyirdi ki, kimə elm öyrədirsinizsə - ona mehriban olun, kimdən bilik öyrənirsinizsə - ona da mehriban olun. Cəmiyyətin sükanı - müəllimlərin əlindədir. Siyasətçini də, dövlət başçısını da alimi də, bir sözlə, hamını, hər kəsi müəllim yetişdirir. Cəmiyyətin əxlaqlı olması - müəllimdən asılıdır".

On birinci sinif şagirdlərinin hansı ixtisas üzrə təhsil alacaqları barədə artıq qəti fikirə gəlmiş olduqları məsələsinə toxunan professor F.Rüstəmov demişdir: "Biz sizin fikirlərinizə hörmətlə yanaşırıq. Ancaq hələ vaxt var ikən sizlər bu barədə bir qədər də fikirləşə bilərsiniz. Bizim bu görüşümüz xüsusilə IX, X siniflərdə təhsilalanlara aiddir. Aşağı sinif şagirdlərinin bu yöndə düşünməsi üçün hələ çox vaxtları var. Mən istərdim ki, ADPU-ya qəbul olmaq istəyənlər daha yüksək bal ilə universitetə qəbul olsunlar".

Respublikada aparılan təhsil siyasətindəki yeniliklərdən bəhs edərkən professor F.Rüstəmov Təhsil Naziri Mikayıl Cabbarovun ali təhsil müəssisələrində "Sabah qrupları" yaradılması layihəsi ətrafında da söz açdı və bu layihənin mahiyyəti barədə ətraflı məlumat verdi.

-Məsələn, deyək ki, ibtidai sinif müəllimliyi ixtisasına 500, yaxud 700 tələbə qəbul olunub. Birinci kursdan sonra bu 500 yaxud 700 nəfərin arasından ən savadlı, ən təfəkkürlü 25 nəfər seçilir. Onlar üçün xüsusi auditoriya, xüsusi müəllimlər, xüsusi təqaüd ayrılır. Onların elm sahəsində inkişafı, magistratura təhsilləri, təhsillərini başa çatdırandan sonra işlə təmin olunmaları dövlətin nəzarətində olur. Biz sizləri bu yerdə görmək istəyirik".

Professor F.Rüstəmov çıxışının sonunda fakültənin 50 illik yubileyinə həsr olunmuş kitablardan, Pedaqoji fakültə müəllimlərinin yaradıcılıqları və onlar haqqında zəngin informasiya verən topluları 211 nömrəli tam orta məktəbin kitabxanasına hədiyyə etdi, məktəblilərə müraciətlə "hansı fakültədən təhsil alacağınızdan asılı olmayaraq, sizləri universitetimizdə görməkdən məmnun olaraq"-dedi.

***

Sonra Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasının müdiri, professor S.Həmidov, Təhsil Problemləri İnstitutunun şöbə müdiri, professor V.Xəlilov, Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının müdiri, professor J.Qədimova, Ümumi pedaqogika kafedrasının müdiri, professor İ.İsayev və professor E.Abaszadə çıxış edərək məktəblilərə pedaqoji təhsilin üstünlüklərindən, müəllim adının şərəfindən, həyatda qazandıqları mövqe üçün öz müəllimlərinə minnətdar olduqlarından, bu gün məktəbli partası arxasında əyləşən gəncləri də bu ucalıqda görmək arzularından söz açdılar.

Görüşdə şagirdləri maraqlandıran suallar cavablandırıldı.

Sonda söz alan 211 nömrəli tam orta məktəbin direktoru V.Babayev və ADPU-nun Pedaqoji fakültəsinin dekanı, professor F.Rüstəmov bu görüş üçün öz minnətdarlıqlarını bildirdilər.

**A.İsgəndərov**

# Filologiya fakültəsinin kollektivi 138 nömrəli tam orta məktəbdə



Son zamanlar təhsildə aparılan uğurlu islahatlardan biri də ali məktəblərlə orta məktəblərin bir-birinə yaxınlaşması, mütəmadi görüşlərin keçirilməsi və qarşılıqlı əlaqələrin genişləndirilməsidir. Bu məqsədlə Təhsil Nazirliyi Bakı şəhərinin rayonlarında istənilən bir orta məktəbi baza məktəbi kimi seçməyi müəllim kadrları hazırlayan universitetlərin qarşısında tələb kimi qoymuşdur. ADPU-nun Filologiya fakültəsi Xətai rayonundakı 138 nömrəli tam orta məktəbi baza məktəbi seçmişdir. Bu məktəbi seçməyin əsas səbəblərindən biri fakültənin həmin məktəblə bundan öncə də əlaqələrinin olması, məktəbin böyük maddi-texnika bazaya və geniş əraziyə malik olmasıdır. 1176 nəfər şagirdi və 115 müəllimi olan bu böyük məktəbə böyük pedaqoji təcrübəyə və şəriştəyə malik olan riyaziyyat üzrə fəlsəfə doktoru Mirfaiq Mirheydərli rəhbərlik edir. Məktəbdə 2010-2011-ci illərdə İNTERNET şəbəkəsi quraşdırılmışdır. Məktəb bir çox tədbirlərin, müsabiqələrin əksəriyyətinin keçirilməsinə ev sahibliyi etmiş, məktəbin şagirdləri həmin müsabiqədə layiqli yer tutmuşlar. Eyni zamanda məktəbin komandası 2013-cü ildə rayon məktəblilərinin XXIV spartakiadasının nəticələrinə görə I yerə, "Cəsurlar" hərbi idman və turizm komandası yarışlarının respublika turunda I yerə, "Şahin" hərbi idman komandası isə II yerə layiq görülmüşdür. 138 nömrəli tam orta məktəb ən böyük uğura isə 2010-cu ildə nail olmuşdur. Belə ki, məktəb Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 5 iyul 2010-cu il tarixli 997 nömrəli sərəncamı ilə Təhsil Nazirliyi tərəfindən keçirilən "İlin ən yaxşı məktəbi" müsabiqəsinin qalibi olmuşdur. Bunlarla yanaşı, məktəbə BRİTİSH COUNCİL-un Dikens 2012 proqramında iştirak etdiyinə görə sertifikat verilmişdir. Bunun nəticəsi olaraq məktəbdə artıq I sinifdən başlayaraq BRİTİSH COUNCİL, Böyük Britaniyanın Kembric Universiteti tərəfindən "İngilis dilinin intensiv tədrisi" pilot layihəsi proqramı həyata keçirilir.

Aprel ayının 29-da Filologiya fakültəsinin bir qrup professor-müəllimi məktəblə ilk tanışlıq görüşü keçirmişdir. Tədbirdə Filologiya fakültəsinin dekan müavini, dosent Pəri Paşayeva, professor Himalay Qasımov, professor Zahid Xəlil, professor Tərlan Novruzov, professor İramin İsayev, professor Əzizxan Tanrıverdiyev, dosent Gülçöhrə Alıyeva, dosent Leyla Vəzirova, "Dədə Qorqud" elmi-tədqiqat laboratoriyasının baş elmi işçisi, şair Oqtay Rza və müəllim Günay Alıyeva iştirak etmişlər.

Böyük akt zalında keçirilən tədbiri giriş sözü ilə məktəbin direktoru Mirfaiq Mirheydərli açdı. O, gələn qonaqları müəllim və şagird kollektivinə təqdim edərək bir daha kollektiv adından qonaqları salamladı, görüşün məqsədini açıqladı və çıxış üçün sözü dosent P.Paşayevaya verdi.

Dosent P.Paşayeva öz çıxışına fakültə haqqında məlumat verməklə başladı və bildirdi ki, ADPU 1921-ci ildən N.Nərimanovun imzaladığı dekret əsasında fəaliyyət göstərir. Burada fəaliyyət göstərən şöbələrdən biri də Tarix-Ədəbiyyat şöbəsi olmuşdur. Bu şöbə 1925/1926-cı tədris ilində tarix və ədəbiyyat şöbələrinə ayrılmışdır. Ədəbiyyat şöbəsi 1933-cü ildən müstəqil dil - ədəbiyyat fakültəsi kimi fəaliyyətə başlamışdır. Bu gün Filologiya fakültəsinə əksəriyyətinizin yaxşı tanıdığı, tez - tez televiziya ekranlarında gördüyünüz filologiya üzrə elmlər doktoru, professor Buludxan Xəlilov başçılıq edir.

Fakültənin nəzdində 9 kafedra, bir elmi-tədqiqat laboratoriyası fəaliyyət göstərir. Fakültənin professor-müəllim heyətinin tərkibində 20 nəfərdən çox elmlər doktoru, professor, 40 nəfərdən çox fəlsəfə doktoru, dosent, 14 nəfər baş müəllim, 50 nəfərdən çox müəllim çalışır. Fakültədə üç ixtisas üzrə: Azərbaycan dili və ədəbiyyatı müəllimliyi, Fransız dili müəllimliyi və İngilis dili müəllimliyi ixtisasları üzrə müəllimlər hazırlanır. Bu gün fakültədə 1264 tələbə təhsi alır. Fakültənin magistratura pilləsində təhsil alan tələbələrinin sayı 150-dən çoxdur. Fakültənin 20-dən artıq aspirant və dissertantı vardır. Hazırda Filologiya fakültəsi universitetin kadr potensialına görə ən iri fakültələrindəndir.

Filologiya fakültəsi şərəfli bir yol keçmiş, öz məzunları ilə fəxr etmişdir. Bu fakültədə təhsil almış yüzlərlə tələbə öz əməli fəaliyyətləri ilə universitetimizə şərəf gətirmişdir. S.Vurğunu, M.Rahimi, M.Dilbazini, C.Xəndanı, H.Araslını, M.Təhmasibi, M.C.Paşayevi, M.İbrahimovu, İ.-Şıxlını və digərlərini buna misal göstərmək olar.

Dosent P.Paşayeva bildirmişdir ki, bu gün sizin görüşünüzə gələn professor-müəllimlərin əksəriyyəti də bizim fakültənin məzunları olmuşdur. Mən özüm də bu fakültəni bitirmişəm və bu gün öz müəllimlərimlə çiyin-çiyinə işləməkdən zövq alıram.

Ötən il sizin məktəbi bitirən məzunlardan 50 nəfəri ali məktəbə, bir nəfəri isə Pedaqoji Kollecə qəbul olunmuşdur. Həmin 51 nəfərdən 9-u respublikanın müxtəlif universitetlərində, o cümlədən 2 nəfəri bizim universitetdə müəllimlik peşəsinə yiyələnirlər. Biz arzu edirik ki, sizin aranızdan daha çox məzun bizim fakültəyə üz tutub gələcəkdə tələbəmiz olsun. Mən inanıram ki, sizin aranızda gələcəyin gözəl müəllimləri, şairləri, yazıçıları vardır. Biz müəllimlər sizə hər cür kömək etməyə hazırıq.

Sonra professor Z.Xəlil, professor Ə.Tanrıverdi, professor İ.İsayev, dosent G.Alıyeva, şair O.Rza öz ürək sözlərini söylədilər və məktəblilərlə görüşməkdən məmnun olduqlarını söylədilər. Şair O.Rza və Z.Xəlil məktəblilərə öz şeirlərini oxudular.

Çıxışların sonunda şagirdlər müəllimlərə suallar ünvanlandırdılar. Şagirdlər suallar verərkən sərbəst idilər və aldıqları cavabdan razı qaldıqları hiss olunurdu.

Tədbirin sonunda dosent P.Paşayeva fakültənin professor- müəllim heyətinin tərtib etdiyi kitablardan məktəbin kitabxanasına hədiyyə verdi. Eyni zamanda fakültənin tarixini, dünənini və bu gününü əks etdirən bukleti məktəblilərə hədiyyə verdi və qeyd etdi ki, siz bu buklet vasitəsi ilə fakültəmiz haqqında geniş məlumat əldə edə bilərsiniz.

**Pəri PAŞAYEVA,**
**Filologiya fakültəsinin dekan müavini, dosent**

# Pedaqogika və psixologiya fakültəsinin kollektivi 36 nömrəli tam orta məktəbdə

Aprel ayının 30-da ADPU-nun Pedaqogika və psixologiya fakültəsinin professor-müəllim və tələbə heyəti Bakı şəhərinin Nərimanov rayonundakı Novruzov qardaşları adına 36 nömrəli tam orta məktəbin yuxarı sinif şagirdləri ilə görüş keçirmişdir.

Görüşdə Pedaqogika və psixologiya fakültəsinin dekanı, dosent Şəhla Əliyeva, dekan müavini, dosent Allahyar İmanov, Yaş və pedaqoji psixologiya kafedrasının müdiri, professor Ərəstun Baxşəliyev, Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev, Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Müseyib İlyasov, Təhsil Problemləri İnstitutunun Məktəbəqədər təhsilin kurikulumu şöbəsinin müdiri, dosent Laləzar Cəfərova, baş müəllimlər Nailə Hüseynova, Zenfira Səlimova, Qəribə Rəhimova, Simnarə Heydərova, Təranə Sadıqova, müəllim Könül Xudazadə, IV tədris ili tələbələri Vəfa Şahgəldiyeva, Aygül Həsənəliyeva, Xanım Bədəlova, III tədris ili tələbəsi Günay Orucova, II tədris ili tələbəsi, universitet Tələbə Gənclər Təşkilatının sədr müavini Turan Kərimli iştirak etmişlər. Görüşdə həmçinin kütləvi informasiya vasitələrinin nümayəndələri də iştirak etmişlər.



Toplantını giriş sözü ilə açan məktəbin direktoru İradə Babayeva görüş iştirakçılarını salamlamış, ADPU-nun zəngin elm və təhsil ənənələrinə malik olduğunu vurğulamışdır. O, şagirdlərə və görüş iştirakçılarına 36 nömrəli tam orta məktəblə ADPU-nun uzun müddət əməkdaşlıq etdiyini bildirmişdir. Sonra ilk olaraq Pedaqogika və psixologiya fakültəsinin dekanı, dosent Şəhla Əliyeva məruzə ilə çıxış etmişdir.

Dosent Ş.Əliyeva ADPU-nun yaranma tarixi, keçdiyi inkişaf yolu, habelə görkəmli məzunları, fakültələri və buradakı təhsilin səviyyəsi haqqında geniş danışmış, universitetdə müasir dövrün tələblərinə cavab verən elmi dəyişikliklər və yeniliklər haqqında şagirdləri ətraflı məlumatlandırmışdır. Fakültənin dekanı öz çıxışında universitetimizi bitirən görkəmli və tanınmış məzunlarından söhbət açmış, onların nəinki Azərbaycanda, həm də ölkəmizin hüdudlarından kənarda tanınmaları haqqında geniş məlumat vermişdir. Dosent Ş.Əliyeva ulu öndərimiz Heydər Əliyevin müəllimlik peşəsinə verdiyi yüksək qiyməti və ADPU-ya olan böyük diqqətini xüsusi qeyd etmişdir.

Bununla yanaşı, dosent Ş.Əliyeva şagirdləri universitetimizin beynəlxalq layihələri ilə tanış etmiş, MTTYM, "Dünyaya baxış" təşkilatının, UNESKO-nun və Təhsil Nazirliyinin dəstəyi ilə fakültəmizdə "İnklüziv təhsil" laboratoriyasının açılması, Polşanın Azərbaycandakı səfirliyinin təşəbbüsü və universitetimizin rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun dəstəyi ilə "Uşaq İnkişaf Mərkəzinin" açılması haqqında ətraflı məlumat verərək tələbələrimiz üçün geniş elmi imkanların açılması haqqında danışmışdır. Fakültəmizdə bakalavr və magistr pilləsində tədris olunan fənlər haqqında və imtahanların elektron test üsulu ilə şəffaf keçməsi haqqında da şagirdlər məlumatlandırıldılar. Fakültə dekanının məruzəsi slayd vasitəsilə görüş iştirakçıları tərəfindən izlənilirdi.

Gənclərin peşə seçiminin düzgün istiqamətləndirilməsinin günün ən aktual problemlərindən biri olduğunu xüsusi vurğulayan fakültə dekanı Ş.Əliyeva gənclərə bu seçimdə yanılmamağı və özlərinin seçdikləri və sevdikləri peşənin arxasınca getməyi tövsiyə etdi.

Sonra fakültəmizin korreksiyaedici təlim, təhsildə sosial-psixoloji xidmət və məktəbəqədər təlim və tərbiyə ixtisaslarının məzunları V.Şahgəldiyeva, A.Həsənəliyeva, G.Orucova və II tədris ili tələbəsi T.Kərimli çıxış etmişlər.

V.Şahgəldiyeva korreksiyaedici təlim ixtisası haqqında və bu ixtisası tədris edən müəllimlər haqqında, eləcə də tədris olunan fənlər haqqında ətraflı məlumat verdi. V.Şahgəldiyeva 11-ci sinif şagirdlərinə korreksiyaedici təlim ixtisasında təhsil alan tələbələrin bu ixtisası nə üçün və hansı məqsədlə seçdiklərini universitet və fakültə rəhbərliyinin onlar üçün yaratdığı şəraitdə həyata keçirtdikləri layihələr vasitəsi ilə izah etdi. Treninqlər, TEC-nin xətti ilə keçirilən tələbə-elmi seminarları və xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün keçirilən xeyriyyə aksiyaları barədə slayd-şou nümayiş etdirildi. Çıxışının sonunda V.Şahgəldiyeva universitetdə belə sağlam və əlverişli təhsil mühitinin yaradılmasına görə ADPU-nun rektoru, professor Yusif Məmmədova minnətdarlığını bildirdi.

A.Həsənəliyeva təhsildə sosial-psixoloji xidmət ixtisası haqqında ətraflı məlumat verdi. O, insanın həyatında psixologiya elminin vacibliyini, münasibətlərin qurulmasında psixoloji durumun rolunu və psixologiya ixtisasının nə üçün seçilməsi barədə ətraflı danışdı. A.Həsənəliyeva çıxışının sonunda şagirdləri məhz bu ixtisasa yiyələnməyə dəvət etdi.

G.Orucova öz çıxışında, məktəbəqədər təhsilin metodikası haqqında geniş məlumat verdi. Məktəbəqədər müəssisələrdə pedaqoji təcrübə keçdiyi zaman praktik biliklərin əldə edilməsi barədə məlumatlar slaydların nümayişi ilə müşayiət edilmişdir.

T.Kərimli çıxış edərək fakültəmizin tələbələrinin asudə vaxtlarının səmərəli və maraqlı keçməsi haqqında ətraflı məlumat verdi. O, qeyd etdi ki, fakültəmizin tələbələri ölkəmizdə və xaricdə keçirilən müsabiqələrdə, forumlarda, idman yarışmalarında iştirak etmiş və yüksək nailiyyətlər qazanmışlar.

Sonra söz fakültəmizin Yaş və pedaqoji psixologiya kafedrasının müdiri, professor Ə.Baxşəliyevə verildi. Professor Ə.Baxşəliyev insanın həyatında peşə seçiminin nə dərəcədə önəmli olduğu haqqında danışdı, fakültəmizin elmi fəaliyyəti haqqında məlumat verdi və şagirdləri məhz bu ixtisasları seçməyə dəvət etdi.

Ümumi psixologiya kafedrasının müdiri, professor R.Əliyev də öz çıxışında peşə seçimində şagirdlərin diqqətli olmağa çağırdı və onlara uğurlar arzuladı.

Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedasının müdiri, dosent M.İlyasov müəllim peşəsinin müqəddəsliyi və bu peşənin incəlikləri barədə ətraflı məlumat verdi və şagirdləri bu peşəni seçməyə çağırdı.

Təhsil Problemləri İnstitutunun Məktəbəqədər təhsilin kurikulumu şöbəsinin müdiri, dosent L.Cəfərova öz çıxışında məktəbəqədər təhsil haqqında danışdı və peşə seçimində şagirdlərə müvəffəqiyyətlər arzuladı.

Görüş nəticəsində yuxarı sinif şagirdləri bütövlükdə ADPU, həmçinin Pedaqogika və psixologiya fakültəsinin nəzdindəki ixtisaslar haqqında ətraflı məlumat əldə etdilər.

Məktəbin direktoru İ.Babayeva fakültənin dekanı, dosent Ş.Əliyevaya və professor-müəllim heyətinə belə dəyərli və məzmunlu görüşün keçirilməsinə görə dərin təşəkkürünü bildirdi. Fakültənin dekanı, dosent Ş.Əliyeva isə fakültə adından məktəbin direktoruna, müəllim və şagird kollektivinə dərin minnətdarlığını bildirdi.

Sonda xatirə şəkili çəkdirildi.

**Nailə Hüseynova,**
**Ümumi psixologiya kafedrasının baş müəllimi,**
**pedaqogika üzrə fəlsəfə doktoru**

# Xeyriyyə tədbiri



Yeni Azərbaycan Partiyasının (YAP) ADPU Qadınlar Şurasının təşəbbüsü ilə aprel ayının 12-də "Azərbaycan Uşaqlar Birliyi Fondu" Qeyri-Hökumət Təşkilatının himayəsində olan kimsəsizlər evində xeyriyyə tədbiri keçirilmişdir. Tədbirin keçirilməsində YAP-ın ADPU Qadınlar Şurası ilə birlikdə universitetin tələbə-gəncləri də iştirak etmişlər. Universitetin dosenti Laçın Həsənova, Nigar Rəhimova, professor Zemfira Abdullayeva, dosent Rəfiqə Məmmədova, dosent Sevinc Cəlilova, dosent İradə Qasımova, dosent Pəri Paşayeva, dosent Elnarə Mehbalıyeva, dosent Süveyrat Həsənova, dosent Səadət Musayeva, dosent Səadət Mazanova, dosent Mətanət Əsgərova, Elxan İsgəndərov kimsəsizlərlə səmimi söhbət etmiş, onların arzu və istəkləri ilə yaxından tanış olmuşlar. Tədbirdə tələbələrə tamaşa göstərilmiş, uşaqlar rəngarəng musiqi proqramı ilə əyləndirilmiş və onlara hədiyyələr təqdim olunmuşdur.

Tədbirin sonunda kimsəsizlər evinin rəhbərliyi ADPU-nun rəhbərliyinə, Qadınlar Şurasına və tələbələrə minnətdarlığını bildirmişdir.

**"Gənc müəllim"**

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Tarix fakültəsinin dekanı, professor Oqtay Sultanova əzizi **Solmaz xanımın** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi akademik Hüseyn Əhmədova həyat yoldaşı **Səyalı xanımın** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi "Türk araşdırmaları" elmi-tədqiqat laboratoriyasının müdiri, professor Elman Quliyevə əzizi **Əligülşad Quliyevin** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İngilis dili və onun tədrisi metodikası kafedrasının dosenti Nailə Əlizadəyə yaxın qohumu **Məhəmməd Axundovun** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının dosenti Şəlalə Nəbiyevaya qayınatası **Adil Nəbiyevin** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Xarici dillər kafedrasının baş müəllimi Məsmə Əliyevaya və Ədəbiyyatın tədrisi metodikası kafedrasının müəllimi Simuzər Əliyevaya anaları **Səfilə xanımın** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İngilis dili və onun tədrisi metodikası kafedrasının baş müəllimi Mirvari Qasımovaya əmisi **Sultan Qasımovun** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi coğrafiya kafedrasının müəllimi İlhamə Qəribovaya anası **Hafizə xanımın** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının əməkdaşı Günel Rizayevaya anası **Almaz xanımın** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi pedaqogika kafedrasının əməkdaşı Kifayət Alıyevaya qardaşı **Sabirin** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: A. Z. İSGƏNDƏROV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi-34, ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 1714
Sayı: 1500
Çapa imzalanıb: 30.04.2014-cü il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompyuter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.